maq / qurtarmaq; **to ~ off 1)** yarımçıq qalmış işi bitirmək / qurtarmaq; **2)** çıxıb getmək, uzaqlaşmaq; *I'm buzy; Clear off at once Mən məşğulam; Bu saat çıxıb get / gedin;* **3)** açılmaq, aydınlaşmaq (*hava haq.*); **to ~ out 1)** yuyub təmizləmək, təmizləmək (*çirkdən, zibildən*); *Clear out the cupboard, please Zəhmət olmasa qab şkafını / dolabı təmizlə / təmizləyin;* **2)** *d.d.* pulsuz qoymaq; *Clear out of my way! Yolumdan çəkil / çəkilin;*
◊ **to ~ an examination paper** imtahan biletində olan bütün suallara cavab vermək; **to ~ *one's* throat** boğazını təmizləmək / arıtlamaq; **to ~ a score / scores** hesablaşmaq, haqq-hesab çürütmək

**clearance** [ˈklıərəns] *n* **1.** təmizləmə, saflaşdırma; saflaşdırılma; **2.** əkin üçün meşənin qırılması; **3.** satma, satılma; satıb / satılıb qurtarma; **4.** gömrük rüsumundan / vergisindən azad olma; **5.** gömrük şəhadətnaməsi; **6.** *id.* qapıdan zərbə (*futbol oyununda*)

**clear-cut** [ˈklıəˈkʌt] *adj* aydın, dəqiq, müəyyən; **~ path to a future** gələcəyə aydın / müəyyən yol; **~ policy** dəqiq siyasət

**clear-eyed** [ˈklıəraıd] *adv* **1.** yaxşı / dəqiq görən; **2.** *məc.* uzaqgörən, ağıllı, fərasətli, gözüaçıq, açıqgözlü

**clear-headed** [ˈklıəˈhedıd] *adj* ağıllı, dərrakəli, zəkalı

**clearing** [ˈklıərıŋ] *n* **1.** təmizləmə, saflaşdırma; **2.** əkin üçün nəzərdə tutulan təmizlənmiş sahə; **3.** tala, açıqlıq, açıq yer, çəmən (*meşədə*); **4.** qüsurun aradan qaldırılması

**clearly** [ˈklıəlı] *adv* **1.** parlaq; aydın; *The sun shone clearly Günəş parlaq işıq saçırdı;* **to speak ~** aydın danışmaq; **to see ~** aydın görmək; **to understand ~** aydın başa düşmək; **2.** şübhəsiz, qeyd-şərtsiz; *This version is clearly wrong Bu variant şübhəsiz düz deyil*

**clearness** [ˈklıənıs] *n* aydınlıq, parlaqlıq, təmizlik; **~ of voice / sound** səsin aydınlığı

**clear-sighted** [ˈklıəˈsaıtıd] *adj* ağıllı, fərasətli, açıqgözlü

**clear-sightedly** [ˌklıəˈsaıtıdlı] *adv* ağılla, fərasətlə, bəsarətlə

**clear-sightedness** [ˌklıəˈsaıtıdnıs] *n* ağıllılıq, fərasətlilik, bəsarətlilik, gözüaçıqlıq, açıqgözlülük

**clear-starch** [ˈklıəsta:tʃ] *v* kraxmallamaq

**cleat** [kli:t] *n* **1.** planka, reyka, tamasa (*ensiz hamar lövhə*); **2.** paz, çiv; **3.** klemma, sıxac

**cleavable** [ˈklı:vəbl] *adj* asan doğranan / yarılan (*odun*)

**cleavage** [ˈkli:vıdʒ] *n* **1.** yarma, yarılma, parçalama, parçalanma; **2.** fikir ayrılığı, ixtilaf, ziddiyyət; **a sharp ~ in society between rich and poor** cəmiyyətdə dövlətlilərlə kasıblar arasında kəskin ziddiyyət; **3.** *fiz.* parçalanma, hissələrə bölünmə / ayrılma

**cleave** [klı:v] *v* **1.** yarmaq, doğramaq; *The axe cleaved the piece of wood Balta odun parçasını yardı;* **2.** parçalamaq, təfriqə / ikitirəlik salmaq; **3.** yarılmaq; *This wood cleaves easily Bu odun asan yarılır;* **4.** sadiq qalmaq (*bir kəsə / şeyə*); **to ~ to a principle** bir prinsipə sadiq qalmaq

**cleaver** [ˈkli:və$^r$] *n* **1.** kərənti; **2.** çapacaq, iri qəssab bıçağı

**clef** [klef] *n mus.* açar (*not sətrinin başında olub, onların mənasını müəyyən edən işarə*); **bass ~** bas açarı; **treble ~** skripka açarı

**cleft$^1$** [kleft] *n* **1.** çat, çatlaq, yarıq, çatlamış yer; **2.** uçurum; **a sharp ~ in society between rich and poor** cəmiyyətdə dövlətlilərlə kasıblar arasında kəskin uçurum

**cleft$^2$** [kleft] *adj* **1.** yarılmış, doğranmış; parçalanmış; **2.** ikiyə ayrılmış / bölünmüş; **~ lip** ikiyə bölünmüş dodaq, dovşandodaq; **~ palate** ikiyə bölünmüş damaq, qurdağızlı

**cleft$^3$** [kleft] **to cleave** *felinin pt, pp formaları*

**clemency** [ˈkleməns‌ı] *n* **1.** mərhəmət, şəfqət, rəhm; yumşaqlıq, iltifat; **2.** yumşaqlıq, mülayimlik (*iqlim haq.*)

**clement** [ˈklemənt] *adj* **1.** mərhəmətli, şəfqətli, rəhmli, rəhmdil; **2.** yumşaq, mülayim (*iqlim haq.*)

**clench$^1$** [klentʃ] *n* **1.** sıxma (*yumruğunu*); **2.** basma (*dişlərini*)

**clench$^2$** [klentʃ] *v* **1.** sıxmaq, qısmaq; yummaq; *He clenched his hands into hard fists O, yumruqlarını bərk-bərk sıxdı;*





**2.** qəti qərar qəbul etmək; **to ~ a matter** məsələni qəti həll etmək

**clenched** [klentʃt] *adj* möhkəm sıxılmış, yumulmuş; **~ fists** sıxılmış yumruqlar

**clergy** [ˈklə:dʒı] *n* (**the ~**) *top.i* ruhanilər

**clergyman** [ˈklə:dʒımən] *n* (*pl* **-men** [-mən]) ruhani, keşiş

**clerical$^1$** [ˈklerıkəl] *n* **1.** ruhani; **2.** klerikal (*klerikalizm tərəfdarı; klerikal partiyasının üzvü*)

**clerical$^2$** [ˈklerıkəl] *adj* **1.** ruhi, mənəvi; **~ garment** *kils.* ibadət libası; **2.** klerikal

**clericalism** [ˈklerıkəlızm] *n* klerikalizm

**clericalist** [ˈklerıkəlıst] *n* klerikalizm tərəfdarı

**clerk$^1$** [kla:k] *n* **1.** dəftərxana / kontor işçisi; **bank ~** bank işçisi / qulluqçusu; **telegraph ~** teleqrafçı; **2.** çinovnik, məmur, hökumət qulluqçusu

**clerk$^2$** [kla:k] *v d.d.* dəftərxanaçı işləmək; mirzəlik etmək

**clerkly** [ˈkla:klı] *adj* **1.** yaxşı xətti olan, qəşəng yazan; **~ hand** yaxşı xətt; **2.** ruhani

**clerkship** [ˈkla:kʃıp] *n* katiblik vəzifəsi

**clever** [ˈklevə$^r$] *adj* **1.** ağıllı, kamallı; **to be ~** ağıllı / kamallı olmaq; **a ~ child** ağıllı / kamallı uşaq; **a ~ student** ağıllı tələbə; *He is a clever child O, ağıllı uşaqdır;* **2.** bacarıqlı, ağıllı, məharətli, mahir, qabil; **~ workman** bacarıqlı / qabiliyyətli işçi

**cleverly** [ˈklevəlı] *adv* ağılla, fərasətlə, bacarıqla, məharətlə

**cleverness** [ˈklevənıs] *n* **1.** ağıllılıq, istedadlılıq, istedad, zəka; **2.** bacarıq, qabiliyyət, məharət

**click$^1$** [klık] *n* **1.** şaqqıldama, şaqqıltı; mırçıltı; **2.** *tex.* dilçə, tətik (*silahda*); **3.** matqab, burğu

**click$^2$** [klık] *v* **1.** bağlamaq (*qapını*), cəftəsini vurmaq; **to ~ the door** qapının cəftəsini vurmaq; **2.** şıqqıldatmaq; **to ~ *one's* tongue** dili ilə şıqqıldatmaq; **to ~ *one's* heels (together)** dabanlarını bir-birinə vurub şaqqıldatmaq

**clicker** [ˈklıkə$^r$] *n* ayaqqabı üzü biçən çəkməçi

**client** [ˈklaıənt] *n* müştəri

**clientage** [ˈklaıəntıdʒ] *n top.i* müştərilər

**cliff** [klıf] *n* **1.** sıldırım, sıldırım qaya; **2.** dərin uçurum

**cliffy** [ˈklıfı] *adj* qayalı, qayalıq, sıldırımlı

**climatal** [ˈklaımətəl] *adj* iqlim; **~ influence** iqlimin təsiri

**climate$^1$** [ˈklaımıt] *n* **1.** iqlim, ab-hava; **mild / healthy / dry / humid / wet ~** yumşaq / sağlam / quru / nəm / yaş iqlim; **moderate ~** mülayim / mötədil iqlim / ab-hava; **2.** mühit, şərait; fikir, rəy; **~ of opinion** ictimai rəy; **international ~** beynəlxalq şərait

**climate$^2$** [ˈklaımıt] *v amer.* **1.** yeni iqlimə uyğunlaşdırmaq, yeni mühitə alışdırmaq; **2.** yeni mühitə / şəraitə uyğunlaşmaq

**climatic** [klaıˈmætık] *adj* iqlim; **~ conditions** iqlim şəraiti

**climatology** [ˌklaıməˈtələdʒı] *n* klimatologiya (*iqlimi öyrənən elm*)

**climax$^1$** [ˈklaımæks] *n* yüksək / ən yüksək nöqtə; **the ~ of a dramatic action** dramatik hərəkətin ən yüksək nöqtəsi

**climax$^2$** [ˈklaımæks] *v* ən yüksək nöqtəyə çatmaq / çatdırmaq

**climb$^1$** [ˈklaım] *n* qalxma, dırmaşma, çıxma; **difficult ~** çətin dırmaşma / çıxma

**climb$^2$** [klaım] *v* **1.** dırmaşmaq, qalxmaq; **to ~ a tree / mountain** ağaca / dağa dırmaşmaq; *The old lady climbs up the stairs with difficulty Qoca xanım pilləkənləri çətinliklə qalxır;* **2.** sarılmaq, sarmaşmaq (*bitki haq.*); *The ivy is climbing up the wall Sarmaşıq divara sarmaşır;* **3.** mənsəbə çatmaq; **to ~ the heights of power** hakimiyyətin yuxarı pilləsinə çatmaq; **4.** *av.* yüksəkliyə qalxmaq;
◊ **to ~ up the ladder** müvəffəqiyyət qazanmaq, mənsəbə çatmaq

**climbable** [ˈklaıməbl] *adj* dırmaşıla bilən, dırmaşmaq / qalxmaq mümkün olan; *Is the tree climbable Bu ağaca dırmaşmaq mümkündürmü?*

**climb-down** [ˈklaımˈdaun] *n* **1.** eniş; **2.** güzəşt (*mübahisədə*); **3.** həqarət, təhqir, təhqir etmə

**climber** [ˈklaımə$^r$] *n* **1.** alpinist; **2.** sarmaşan bitki; **3.** mənsəbpərəst, şöhrətpərəst; **4.** *pl* montyor caynağı (*şalbana dırmaşmaq / çıxmaq üçün*);
◊ *Hasty climbers have sudden falls at. söz.* ≅ *Tələsən təndirə düşər*

**clinch**[1] [klɪntʃ] *n* **1.** sıxma; sıxac; sancaq; **2.** bir-birini tutma (*boks oyununda*)

**clinch**[2] [klɪntʃ] *v* **1.** əymək, qatlamaq, bükmək (*mismarı*); pərçimini açmaq (*boltun*); **2.** tutmaq (*boks oyununda rəqibi*); **3.** razılaşmaq, işləri yoluna qoymaq; **to ~ the case** məsələni həll etmək; **4.** *d.d.* qucaqlamaq, ağuşuna almaq

**clincher** [ˈklɪntʃəʳ] *n* **1.** pərçimçi, pərçim ustası; **2.** çənbər, dəmir bənd

**cling** [klɪŋ] *v* **1.** yapışmaq; ilişmək; tutmaq; bərk-bərk yapışmaq; *Mud clings to the boots Palçıq ayaqqabıya yapışır; Wet clothes cling to the body Yaş paltar bədənə yapışır;* **2.** sallanmaq; *Heavy clouds clung to the mountains Ağır buludlar dağların üstünə sallanmışdı;* **3.** yapışmaq / oturmaq (*paltar haq.*);
◊ **to ~ like grim death** var qüvvəsi ilə yapışmaq

**clinging** [ˈklɪŋɪŋ] *adj* yapışan (*bədənə*); **~ dress** yapışan paltar

**clingstone** [ˈklɪŋstoun] *n* çıxmayan çəyirdək (*şaftalıda və s.*)

**clingy** [ˈklɪŋɪ] *adj* yapışan, yapışqan

**clinic** [ˈklɪnɪk] *n* **1.** *tib.* klinika; müalicəxana; **2.** şəxsi xəstəxana; **3.** poliklinika (*xəstəxananın nəzdində*)

**clinical** [ˈklɪnɪkl] *adj* klinika, klinik; **~ record** xəstəliyin tarixi; xəstəliyin tarixini yazmaq üçün blank

**clink**[1] [klɪŋk] *n* cingilti (*şüşənin, açarların, dəmir pulun*)

**clink**[2] [klɪŋk] *v* **1.** cingildəmək; *Glasses / Keys / Coins clink Şüşələr / Açarlar / Dəmir pullar cingildəyir;* **2.** cingildətmək; **to ~ glasses** badələri cingildətmək

**clip**[1] [klɪp] *n* I **1.** sıxac; sancaq, qısqac, dəftərxana sancağı; **paper ~** kağız sancağı; *Fasten these sheets of paper together with a clip Bu kağız vərəqlərini dəftərxana sancağı ilə bir yerə bərkit / bərkidin;* **2.** pərçim, dəmir bənd; **3.** sıxmaq üçün kəlbətin; **4.** broşka (*bəzək sancağı*); **5.** patron darağı

**clip** [klɪp] *n* II **1.** saç fasonu; kəsmə (*dırnağı*), yun qırxma; **2.** cəld zərbə; *He hit the child a clip O, uşağa cəld zərbə vurdu;* **3.** *d.d.* cəld yeriş; **to go at a good ~** cəld addımlarla getmək

**clip**[2] [klɪp] *v* (**-pp-**) I sıxmaq; bərkitmək (*dəftərxana sancağı ilə*); **to ~ sheets of paper together** kağız vərəqlərini bir yerə bərkitmək

**clip** [klɪp] *v* (**-pp-**) II **1.** kəsmək (*qayçı və s. ilə*); **to ~ an article / a picture from a newspaper** qəzetdən məqalə / şəkil kəsmək; **2.** kəsmək; *I'll clip your ear if you don't behave Özünü / Özünüzü yaxşı aparmasan / aparmasanız qulağını / qulağınızı kəsəcəm;* **2.** qırxmaq, gödəltmək (*saç və s.*); **to ~ sheep** qoyunu qırxmaq; **3.** *dilç.* qısaltmaq (*sözü*);
◊ **to ~ someone's wings** bir kəsin qolqanadını sındırmaq / kəsmək

**clipped** [klɪpt] *adj* **1.** qırxılmış, kəsilmiş; **~ hair** qırxılmış saç; **2.** qısaldılmış; **~ word** qısaldılmış söz

**clipper** [ˈklɪpəʳ] *n* I **1.** bağ qayçısı; **2.** baş qırxmaq üçün maşın; **3.** heyvan qırxmaq üçün maşın, qırxılıq; **4.** *tex.* itiağız kəlbətin

**clippie** [ˈklɪpɪ] *n d.d.* qadın konduktor (*avtobusda, tramvayda*)

**clipping** [ˈklɪpɪŋ] *n* **1.** qəzetdən kəsilmiş parçalar; **2.** qayçılama, qırxma, kəsmə; **3.** yonqar, qırıntı; **nail ~s** dırnaq yonqarı / qırıntıları; **4.** qırxım, yun qırxımı

**clique**[1] [kli:k] *n* dəstə, güruh, kampaniya

**clique**[2] [kli:k] *v* dəstə / güruh yaratmaq

**cloak**[1] [klouk] *n* **1.** plaş, yağmurluq; **2.** bəhanə; maska; **under the ~ of charity** mərhəmət maskası altında; **3.** örtük; pərdə; **~ of snow** qar örtüyü

**cloak**[2] [klouk] *v* **1.** bürüncəklə örtmək; **2.** gizlətmək, örtmək, maskalamaq; *He cloaked his wicked purpose appearing to be friendly Özünü dost kimi göstərməklə o, öz məkrli məqsədini maskaladı*

**cloak-room** [ˈkloukru:m] *n* **1.** qarderob (*paltar saxlanılan yer*); **2.** *d.y.* saxlama kamerası; **3.** tualet, ayaqyolu (*xüs. ictimai yerlərdə*)

**clobber** [ˈklɔbəʳ] *n dd* **1.** geyim, paltar; *I like your new clobber Mən sənin / sizin təzə paltarını / paltarınızı xoşlayıram;* **2.** şey-şüy; bir kəsə məxsus şeylər

**clock**[1] [klɔk] *n* saat (*stolüstü, divar, qüllə*); **hanging ~** asma saat; **talking ~** danışan saat; **the face of a ~** saatın siferblatı; *The clock is fast / slow Saat irəlidir / geridir;*





◊ **~ watcher** tənbəl işçi (*saatı gözləyən*); **like a ~** saat kimi (*dəqiq, düz*); **to sleep / to work the ~ round** 12 saat ara vermədən yatmaq / işləmək

**clock**[2] [klɔk] *v* **1.** xronometraj vasitəsilə ölçmək (*vaxtı: müxtəlif yarışlar zamanı*); **2.** *id.* vaxt göstərmək; **3.** işə gəlmə və işdən getmə vaxtını qeyd etmək

**clockcase** [ˈklɔkkeɪs] *n* saat qabı

**clock-face** [ˈklɔkfeɪs] *n* siferblat (*saat və ölçü cihazlarında üzərində rəqəmlər olan lövhəcik*)

**clocking** [ˈklɔkɪŋ] *n* vaxtı qeydə alma

**clocking-hen** [ˈklɔkɪŋhen] *n* qırt / kürt toyuq

**clockmaker** [ˈklɔk,meɪkəʳ] *n* saatsaz, saatqayıran

**clockwise** [ˈklɔkwaɪz] *adv* saat əqrəbi istiqamətində

**clod**[1] [klɔd] *n* **1.** kəsək; qaya; **to break the ~s** kəsəyi / qayanı qırmaq; **2.** laxta (*qan haq.*); **3.** səfeh / axmaq / gic adam

**clod**[2] [klɔd] *v* **1.** yapışmaq, yatmaq (*bir vəziyyətdə çox qalmaq nəticəsində*); **2.** laxtalanmaq (*qan haq.*)

**cloddish** [ˈklɔdɪʃ] *adj* **1.** sarsaq, səfeh, axmaq, gic, ağılsız, başıboş, yelbeyin; **2.** fleqmatik, soyuqqanlı, laqeyd, süst; qaraqabaq, üzügülməz; ləng

**cloddy** [ˈklɔdɪ] *adj* kəsəkli, nahamar, dübür-dübür, kələ-kötür

**clod-hopper** [ˈklɔd,hɔpəʳ] *n* **1.** əkinçi, cütçü; **2.** tənbəl, yöndəmsiz / ağırtərpənən adam

**clog**[1] [klɔg] *n* **1.** ağırlıq (*heyvanların hərəkətini məhdudlaşdırmaq və ya çətinləşdirmək üçün onların ayağından asılmış*); **2.** maneə, əngəl, çətinlik; **3.** zibilləmə; tutulma (*boru və s. haq.*); **4.** altı taxtadan olan ayaqqabı

**clog**[2] [klɔg] *v* (**-gg-**) **1.** mane olmaq, çətinlik / əngəl törətmək; **to ~ *smb.'s* movement** bir kəsin hərəkətinə mane olmaq / əngəl törətmək; **2.** zibilləmək, çirkləndirmək; tutmaq (*kanalı, borunu və s.*); bağlanmaq, tutulmaq; *The road was clogged with cars Maşınlar yolu bağlamışdı / tutmuşdu;* **3.** zibillənmək, tutulmaq, çirklənmək; **4.** ayaqqabıya taxtadan altlıq vurmaq

**cloggy** [ˈklɔgɪ] *adj* **1.** kəsəkli, nahamar, dübür-dübür; **2.** suvaşqan, yapışqan; qatı; **3.** asanlıqla çirklənən

**cloister**[1] [ˈklɔɪstəʳ] *n* monastır; **to retire to a ~** monastıra getmək (*yaşamaq üçün*); **to confine / to shut up *smb.* in a ~** bir kəsi monastıra salmaq / göndərmək

**cloister**[2] [ˈklɔɪstəʳ] *v* **1.** monastıra salmaq / göndərmək; **2.** tənha bir yerə çəkilmək, adamlardan uzaqlaşmaq

**cloistered** [ˈklɔɪstəd] *adj* **1.** salınmış, sürgün edilmiş (*monastıra və s.*); **2.** tənha, yalqız, tək-tənha

**cloistral** [ˈklɔɪstrəl] *adj* **1.** monastır, asket, zahid; **~ life** asket / zahid həyatı; **2.** monastıra salınmış / göndərilmiş / sürgün edilmiş; **3.** guşənişin

**close**[1] [klous] *n* I **1.** divarla əhatələnmiş / ətrafına divar çəkilmiş yer (*evin və ya kəndin yaxınlığında*); **2.** oyun meydançası (*məktəbin yanında*);

**close** [klous] *n* II **1.** son, axır; qurtaracaq; nəticə; **at the ~ of the party** qonaqlığın sonunda / axırında; *At the close of the party there were few guests who weren't drunk Qonaqlığın sonunda demək olar ki, hamı sərxoş idi;* **at the ~ of *one's* days** ömrünün sonunda / axırında; **to draw to a ~** sona / axıra yaxınlaşdırmaq; **2.** bağlama, işin qurtarması; **at the ~ of the shop** mağaza bağlananda

**close**[2] [klous] *adj* I **1.** bağlı, qapalı, örtülü; **~ carriage** bağlı / örtülü minik (*fayton, araba və s.*); **~ vowel** *fon.* qapalı sait; **~ time / season** bağlı mövsüm (*ovçuluq üçün*); **~ election** qapalı / gizli seçki; **2.** tənha, yalqız, tək-tənha; **to keep oneself ~** tənha / yalqız yaşamaq; **3.** gizli, gizlin; üstüörtülü, məxfi; **~ intent** gizli niyyət / məram; **to lie / to keep ~** gizlənmək; gözdən itmək; **to keep *smth.* ~** bir şeyi gizli saxlamaq

**close** [klous] *adj* II **1.** yaxın; *Our house is close to the station Bizim evimiz vağzala yaxındır;* **2.** çox yaxın; səmimi; *He is a close friend of mine O mənim çox yaxın / səmimi dostlarımdan biridir;* **3.** sıx; **~ contact** sıx əlaqə; **4.** qalın (*parça və s. haq.*); **~ texture** qalın parça; **~ thicket** qa-

lın cəngəllik / meşə; **5.** bədənə yapışan (*paltar haq.*); **6.** sıx, yığcam (*xətt*); **7.** boğucu, ağır, bürkü, boğanaq; bürkülü (*hava haq.*); ~ **air** boğucu / ağır hava; ~ **day** bürkülü gün; **8.** əsaslı, ətraflı; ~ **investigation** əsaslı / ətraflı tədqiqat; **9.** dəqiq, düz; ~ **translation** dəqiq tərcümə; **10.** xəsis, simic, dargöz; *He is close with his money O, xəsisdir / simicdir*

**close**[3] [klouz] *v* I **1.** örtmək, bağlamaq; yummaq; **to ~ a door / a window** qapını / pəncərəni örtmək; **to ~ *one's* mouth** ağzını yummaq; **2.** örtülmək, bağlanmaq; *The window / The door won't close Pəncərə / Qapı örtülmür;* **4.** *el.* qapamaq; **to ~ down 1)** bağlamaq, işini / fəaliyyətini dayandırmaq; qapanmaq; *Schools were closed down by the influenza epidemic Qrip epidemiyası ilə əlaqədar olaraq məktəblər bağlandı;* **to ~ down a factory** fabriki bağlamaq; **2)** bağlanmaq, ləğv olunmaq; *The theatre closes down Teatr ləğv olunur;* **3)** boğmaq, susdurmaq; **to ~ up 1)** bağlamaq (*zərfi*); **2)** örtülmək, bitişmək (*yara haq.*); **3)** kip bağlamaq;
◊ **to have *one's* eyes ~d** bir şeyə göz yummaq; **to ~ *one's* parent's eyes** valideynin gözünü bağlamaq, valideynin ölümünün şahidi olmaq; **to ~ *smb.'s* eye** bir kəsin gözünü vurub əzmək / göyərtmək / zədələmək; **to ~ *one's* ear to** qulaqardına vermək / vurmaq

**close** [klouz] *v* II **1.** qurtarmaq, tamamlamaq, başa çatdırmaq; **to ~ a speech** nitqi / çıxışı qurtarmaq; **2.** bağlamaq; **to ~ a meeting** iclası bağlamaq; **to ~ an account** *mal.* hesabı bağlamaq; **3.** qurtarmaq, başa çatmaq / gəlmək; *His short life closed Onun qısa ömrü qurtardı / başa çatdı;*
◊ **to ~ *one's* days** günlərini / ömrünü başa vurmaq, dünyasını dəyişmək, ölmək

**close** [klouz] *v* III yaxınlaşmaq, yaxına gəlmək; birləşmək; *We must close the ranks to secure peace Sülhü təmin etmək üçün biz birləşməliyik;* **to ~ in 1)** düşmək; bürümək, çulğalamaq; *Night closed in Gecə düşdü; Mist closed in upon us Duman bizi bürüdü / çulğaladı;* **2)** əhatə / mühasirə etmək; *The enemy now closed in upon us Düşmən bizi mühasirəyə aldı*

**close-cropped** [ˈklousˈkrɔpt] *adj* qısa qırxılmış, qısa kəsilmiş

**closed** [klouzd] *adj* bağlı; bağlanmış; örtülü, örtülmüş, qapalı; ~ **syllable** *fon.* qapalı heca;
◊ **with ~ doors** örtülü / bağlı qapılar arxasında

**close-down** [ˈklouzˈdaun] *n* işin dayanması / dayandırılması (*müəssisənin bağlanması ilə əlaqədar olaraq*)

**close-fisted** [ˈklousˈfistɪd] *adj* xəsis, simic

**close-handed** [ˈklousˈhændɪd] *adj* əlbəyaxa; ~ **fight** əlbəyaxa vuruş / vuruşma

**close-harbour** [ˈklousˈha:bəʳ] *n* bağlı / qapalı liman

**closely** [ˈklouslɪ] *adv* **1.** yaxından; yaxın; *He resembles his father very closely O, atasına çox oxşayır;* **2.** sıx; sıx-sıx; kip, möhkəm; ~ **packed** kip qablaşdırılmış; **to work ~ with *smb.*** bir kəslə sıx əlaqədə işləmək; **3.** diqqətlə; əsaslı tərzdə / surətdə; **to examine a case ~** işi diqqətlə nəzərdən keçirmək; **to look ~ at *smb.*** bir kəsə diqqətlə baxmaq

**closeness** [ˈklousnɪs] *n* **1.** bürkü, boğanaq, isti, boğunuqluq (*hava haq.*); ~ **of atmosphere** havanın ağırlığı / boğunuqluğu; ~ **of the room** otağın bürküsü / boğanağı; **2.** sıxlıq, kiplik; qalınlıq; ~ **of texture** parçanın qalınlığı; **3.** xəsislik, simiclik

**closet**[1] [klɔzɪt] *n* **1.** *amer.* kiçicik anbar, anbarça; **2.** kabinet (*kabinet üçün mebel komplekti*); **bed ~** balaca yataq otağı; **3.** tualet, ayaqyolu

**closet**[2] [ˈklɔzɪt] *adj* **1.** gizli; gizlədilmiş, məxfi, üstüörtülü; ~ **vows** gizli əhd-peyman; **2.** kabinet; həyatdan uzaq; ~ **politician** həyatdan uzaq siyasətçi

**closet**[3] [klɔzɪt] *v* bağlamaq, çəkilmək (*bir yerə*); **to be ~ed with *smb.*, to be ~ed together** bir kəslə təklikdə məsləhətləşmək

**close-tongued** [ˈklousˈtʌŋd] *adj* azdanışan, dilini sakit saxlayan

**closing** [ˈklouzɪŋ] *adj* son, yekun, axır; ~ **speech** son söz, yekun sözü; ~ **stock inventory** son inventarizasiya, yekun inventarizasiyası

**closing switch** [ˈklouzɪŋˈswɪtʃ] *n el.* elektrik açarı, rubilnik (*güclü elektrik cərəyanını kəsən açar*)





**closing-time** [ˈklouzɪŋtaɪm] *n* bağlanma vaxtı (*müəssisələrin, mağazaların və s.*)

**closure**[1] [ˈklouʒəʳ] *n* **1.** bağlama, bağlanma, dayanma; **a one-week ~ of schools** məktəblərdə dərslərin bir həftəlik dayandırılması; **2.** müzakirənin / mübahisənin dayandırılması; **to move the ~** müzakirəni dayandırmağı təklif etmək; **3.** *fon.* kipləşmə

**closure**[2] [ˈklouʒəʳ] *v* müzakirəni qurtarmaq / kəsmək (*parlamentdə və s.*)

**clot**[1] [klɔt] *n* **1.** kəsək, kəltən; **2.** qan laxtası, laxtalanmış qan; tromb; **3.** küt, korazehin, kütbeyin, gic (*adam*)

**clot**[2] [klɔt] *v* **1.** laxtalanmaq; qatılaşmaq; **2.** kəltənləşmək, kəltənə dönmək

**cloth** [klɔ:θ] *n* parça (*yundan, pambıqdan və s. toxunmuş*); **American ~ 1)** müşəmbə; **2)** dermatin; **3)** süni dəri

**clothe** [klouð] *v* **1.** geyindirmək, geydirmək; **to ~ *one's* family** ailəni geydirmək, ailəni paltarla təmin etmək; **2.** geymək, geyinmək; **to ~ oneself** geyinmək; *She clothed herself in her best O ən yaxşı paltarını geydi;* **3.** örtmək, bürümək, çulğamaq; *Mist clothed the mountains Duman / Çən dağları bürüdü / çulğadı / örtdü;* **4.** qərq etmək; *The sun clothed the village with light Günəş kəndi işığa qərq etmişdi*

**clothes** [klouðz] *n pl* **1.** geyim, libas; üst-baş; **Sunday ~** bayram paltarı; **work-day ~** iş paltarı; **plain ~** mülki paltar; **2.** yataq dəyişəyi (*döşəkağı, balışüzü və s.*)

**clothes-basket** [ˈklouðz,ba:skɪt] *n* paltar səbəti

**clothes-brush** [ˈklouðzbrʌʃ] *n* paltar şotkası

**clothes-line** [ˈklouðzlaɪn] *n* paltar kəndiri, zivə

**clothes-moth** [ˈklouðzmɔθ] *n* paltar güvəsi

**clothes-peg** [ˈklouðzpeg] *n* sancaq, sıxac

**clothes-pin** [ˈklouðzpɪn] *n amer.* = **clothes-peg**

**clothing** [ˈklouðɪŋ] *n* **1.** paltar, geyim, üst-baş; **articles of ~** geyim şeyləri; **ready-made ~** hazır paltar; **2.** hərbi geyim / paltar

**clothing-store** [ˈklouðɪŋstɔ:] *n amer.* parça mağazası

**cloth-line** [ˈklɔ:θlaɪn] *n d.d.* radio antennası

**cloth-maker** [ˈklɔ:θ,meɪkə] *n* mahud ustası

**clotted** [ˈklɔtɪd] *adj* **1.** kəsəkli, nahamar, kəltənli; dübür-dübür; **2.** qatılaşdırılmış, qatılmış, laxtalanmış; ~ **blood** laxtalanmış qan; ~ **cream** qaynadılmış qatı qaymaq;
◊ ~ **nonsense** tam cəfəngiyat

**clotty** [ˈklɔtɪ] *adj* **1.** qatılaşdırılmış, qatılaşmış; **2.** kəsəkli, kəltənli, dübür-dübür

**cloud**[1] [klaud] *n* **1.** bulud, qara bulud; *There wasn't a cloud in the sky Göydə / Səmada bir dənə də bulud yox idi;* **2.** burum, sütun, bulud (*tüstü haq.*); ~ **of dust / steam** toz / buxar burumu / sütunu; **3.** bir yığın, minlərcə; çoxlu, külli miqdar; ~ **of mosquitoes** külli miqdar ağcaqanad; ~ **of flies** saysız-hesabsız milçək; **4.** örtük, örtü; pərdə;
◊ ~ **buster 1)** göydələn; **2)** sürətli təyyarə; **to blow a ~** papiros çəkmək; **to have *one's* head in the ~s, to be in the ~s** göylərdə uçmaq (*dünyadan xəbərsiz olmaq*); **to drop from the ~s** göydən düşmək, gözlənilmədən baş vermək; **to lose oneself in the ~s** çaşıb qalmaq;
◊ *Every cloud has a / its silver lining* ≡ *Hər bir yamanda bir yaxşılıq var, Yaxşısız yaman olmaz*

**cloud**[2] [klaud] *v* **1.** buludla örtmək / örtülmək; *The moon is clouded Ay buludla örtülüb; The sky clouded over Göy / Səma buludla örtüldü;* **2.** kədərləndirmək, qəmləndirmək, əhvalını pozmaq / korlamaq; **to ~ the happiness** xoşbəxtliyi korlamaq; **3.** əhvalı pozulmaq, qanı qaralmaq, pərt olmaq; **4.** ləkələmək (*adını, şərəfini*); **5.** dumanlanmaq, dumanlandırmaq; bulandırmaq; *Her eyes clouded over Onun gözü dumanlandı*

**cloudberry** [ˈklaud,berɪ] *n bot.* sarı böyürtkən

**cloud-burst** [ˈklaudbə:st] *n* leysan

**cloud-capped** [ˈklaudkæpt] *adj* buluda bürünmüş, buludla çulğalanmış (*dağın başı haq.*)

**cloud-capt** [ˈklaudkæpt] *adj* = **cloud-capped**

**clouded** [ˈklaudɪd] *adj* donuq, tutqun; ~ **glass** donuq / tutqun şüşə

**cloudiness** [ˈklaudɪnɪs] *n* **1.** buludluluq, buludluq; **2.** dumanlanma, tutqunlaşma

**cloudless** [ˈklaudlɪs] *adj* buludsuz, aydın; **~ sky** buludsuz / aydın səma
**cloudy** [ˈklaudɪ] *adj* **1.** buludlu; **~ sky** buludlu səma / göy; **2.** dumanlanmış, dumanlı; aydın / aşkar olmayan; örtülü; **~ knowledge** dumanlı məlumat / bilik; **~ idea** dumanlı ideya; **3.** tutqun; qaşqabaqlı; **4.** bulanıq; **~ liquid** bulanıq maye
**clouted** [ˈklautɪd] *adj* I yamanmış, gözənmiş, yamaq qoyulmuş / salınmış
**clouted** [ˈklautɪd] *adj* II qatılaşmış, qəlizləşmiş, laxtalanmış, laxtalandırılmış; laxta
**clouted-cream** [ˈklautɪdˈkri:m] *n* qaynadılmış qatı qaymaq
**clout-nail** [ˈklautneɪl] *n* yastıbaşlı mismar / mıxça
**clove** [klouv] *n* mixək; **oil of ~s** mixək yağı
**clove²** [klouv] *v* mixək qatmaq / vurmaq
**clove³** [klouv] **to cleave** *felinin pt, pp formaları*
**cloven¹** [ˈklouvn] *adj* **1.** haçalanmış; ayrılmış, ikilənmiş; **~ hoof / foot** haçalanmış / ikiyə ayrılmış ayaq / dırnaq (*məməli heyvanlarda*); **2.** pis / yaman məram; şeytan, fitnə-fəsadlı
**cloven²** [ˈklouvn] **to cleave** *felinin pp forması*
**cloven-footed** [ˈklouvnˈfutɪd] *adj* **1.** qoşadırnaqlı, cütdırnaqlı (*heyvan haq.*); **2.** şeytan, iblisanə, məkrli, kinli, qeyzli
**cloven-hoofed** [ˈklouvnˈhu:ft] *adj* = **cloven-footed**
**clove-pink** [ˈklouvpɪŋk] *n bot.* bağ qərənfili
**clover** [ˈklouvəʳ] *n bot.* yonca;
◊ **to be / to live in ~** dəbdəbə / cah-calal içərisində yaşamaq
**clover** [ˈklouvəʳ] *v* yonca səpmək
**clover-leaf** [ˈklouvəli:f] *adj* yonca yarpağı
**clove-tree** [ˈklouvtri:] *n bot.* mixək ağacı
**clow** [klau] *n* şlüz qapısı
**clown¹** [klaun] *n* **1.** kloun; **2.** təlxək
**clown²** [klaun] *v* **1.** təlxəklik etmək; **2.** axmaq-axmaq / səy-səy hərəkət etmək
**clownish** [ˈklaunɪʃ] *adj* kloun, təlxək; **~ dress** kloun / təlxək paltarı; **~ behaviour** kloun / təlxək hərəkəti
**clownishness** [ˈklaunɪʃnɪs] *n* klounluq, təlxəklik, oyunbazlıq
**cloy** [klɔɪ] *v* doydurmaq; çiyrindirmək, ürəyini vurmaq; *Chocolates start to cloy if you eat too many Şokoladı həddən artıq yeyəndə adam çiyrinir / adamın ürəyini vurur*
**club¹** [klʌb] *n* I **1.** dəyənək, kötək; **2.** *id.* hokkey ağacı; **3.** qundaq (*tüfəngdə*)
**club** [klʌb] *n* II **1.** klub; *He started for the club in the afternoon Günortadan sonra o, kluba getdi*
**club** [klʌb] *n* III *pl* xaç, xaç xallı qumar kağızları
**club²** [klʌb] *v* (**-bb-**) I dəyənəklə / kötəklə / qundaqla döymək
**club** [klʌb] *v* (**-bb-**) II (*adət.* **to ~ together**) bir yerə yığılmaq / toplanmaq; *We clubbed together to buy them a new television Biz onlara yeni televiziya almaq üçün bir yerə yığışdıq* (*yəni pul topladıq*)
**clubfoot** [ˌklʌbˈfut] *n* əyriqıç (*anadangəlmə*)
**clubfooted** [ˈklʌbˈfutɪd] *adj* əyriayaq, ayağı əyri
**club-house** [ˈklʌbˈhaus] *n* klub binası
**club-law** [ˈklʌbˈlɔ:] *n* I zorakılıq, yumruq qanunu
**club-law** [ˈklʌbˈlɔ:] *n* II klubun nizamnaməsi
**club-man** [ˈklʌbmən] *n* (*pl* **-men** [-mən]) klub üzvü
**clubwoman** [ˈklʌbˌwumən] *n* (*pl* **-women** [-ˌwɪmɪn]) klub üzvü və ya həmişə kluba gedən qadın
**cluck¹** [klʌk] *n* qaqqıldama (*toyuq haq.*)
**cluck²** [klʌk] *v* **1.** qaqqıldamaq (*toyuq və s.*); **2.** deyinmək, şikayət etmək, donquldanmaq
**clue¹** [klu:] *n* **1.** çətinlikdən çıxmaq üçün açar, yolgöstərən xətt; **~ to a puzzle** tapmacanı açmaq üçün açar; **2.** sübut, dəlil
**clue²** [klu:] *v amer.* **1.** xəbər vermək (*bir kəsə bir şey haqqında*); **2.** aşkar etmək (*yeni faktları və s.*); **3.** sirri açmaq / faş etmək
**clump¹** [klʌmp] *n* **1.** qaya, qayma (*iri daş, buz və s. parçası*), kəsək; **2.** kötük; **3.** kol; **~ of lilacs** yasəmən kolu; **4.** ağır addım səsi
**clump²** [klʌmp] *v* **1.** bir qrupa yığmaq; **2.** qrup halında əkmək; **3.** ağır-ağır və yöndəmsiz yerimək; **4.** ikiqat ayaqaltı salmaq / vurmaq (*ayaqqabıya*)
**clumsiness** [ˈklʌmzɪnɪs] *n* **1.** ağırlıq, lənglik; yöndəmsizlik; ağır tərpənmə; **2.** kobudluq, qabalıq, ədəbsizlik





**clumsy** [ˈklʌmzɪ] *adj* **1.** ağır, ləng, təhərsiz; **~ gesture** ağır / ləng jest (*əl-qol hərəkəti*); **2.** yöndəmsiz, qaba, yaraşıqsız; **~ furniture** yöndəmsiz / yaraşıqsız mebel; **~ shoes** yöndəmsiz ayaqqabı; **~ verse** biçimsiz şer; **3.** kobud, ədəbsiz; yersiz
**cluster¹** [ˈklʌstəʳ] *n* **1.** salxım; dəstə; **~ of grapes** bir salxım üzüm; **a ~ of bees** bir dəstə arı; **a ~ of flowers** bir dəstə gül; **2.** qrup; **a ~ of islands** bir qrup ada; **~ of stars** bir qrup ulduz
**cluster²** [ˈklʌstəʳ] *v* **1.** salxım halında böyümək; **2.** qrup halında yığışmaq / toplaşmaq; *A group of old women clustered round her Bir qrup qoca qadın onun ətrafına toplaşdı;* **3.** sıx əlaqədə olmaq, assosiasiya üzrə əlaqə yaratmaq
**clustered** [ˈklʌstəd] *adj* **1.** salxım şəklində inkişaf edən / böyüyən; **2.** dəstəyə vurulmuş, dəstələnmiş
**clutch¹** [klʌtʃ] *n* I **1.** *pl* caynaq; pəncə, ayaq; **2.** sıxma, sıxılma; tutma, yapışma; **to make a ~ (at)** tutmaq, yapışmaq (*bir şeydən*);
◊ **to get / to fall into** ***smb.'s*** **~ es** bir kəsin caynağına keçmək; **to get out of** ***smb.'s*** **~ es** bir kəsin caynağından xilas olmaq / qurtarmaq
**clutch** [klʌtʃ] *n* II **1.** yumurta olan yuva; **2.** anasından ayrılmış balalar (*quş və ya heyvanlar*)
**clutch²** [klʌtʃ] *v* I yapışmaq, tutmaq; *The child clutched my hand Uşaq əlimdən möhkəm yapışdı;*
◊ *A drowning man will clutch at a straw at. söz. Suda boğulan adam saman çöpündən yapışar*
**clutch** [klʌtʃ] *v* II qırt / kürt yatıb bala çıxartmaq (*quşlar haq.*)
**clutter²** [ˈklʌtəʳ] *v* **1.** qarışıqlıq / xaos yaratmaq; tökub-töküşdürmək; *The desk was cluttered up with books Kitablar necə gəldi yazı stolunun üstünə tökülmüşdü;* **2.** səs / səs-küy salmaq, gurultu qoparmaq; **3.** anlaşılmaz bir surətdə danışmaq
**clyster¹** [ˈklɪstəʳ] *n tib.* imalə
**clyster²** [ˈklɪstəʳ] *v tib.* imalə etmək
**clyster-pipe** [ˈklɪstəpaɪp] *n tib.* imalə borusu
**coach¹** [koutʃ] *n* I **1.** karet, minik (*fayton və s.*); **2.** *d.d.* poçt kareti; **3.** kupelərə bölünmüş sərnişin vaqonu; **4.** *amer.* yataq yeri olan vaqon; **5.** şəhərlərarası turist avtobusu
**coach** [koutʃ] *n* II **1.** *d.d.* repetitor; **2.** *id.* məşqçi; **a football ~** futbol məşqçisi
**coach²** [koutʃ] *v* I **1.** karetdə aparmaq; **2.** karetlə / faytonla getmək
**coach** [koutʃ] *v* II **1.** təkrar etmək; zəif oxuyan şagirdə / tələbəyə kömək etmək; **2.** repetitorla məşğul olmaq; şagirdi / tələbəni imtahana hazırlamaq; **3.** *id.* məşq etmək; yarışa hazırlaşmaq
**coach-box** [ˈkoutʃbɔks] *n* eşşək (*tikintidə işlədilən hündür ayaqaltı*)
**coachee** [kouˈtʃi:] *n d.d.* faytonçu, arabaçı
**coacher** [ˈkoutʃəʳ] *n* qoşqu / fayton atı
**coachful** [ˈkoutʃfl] *n* bir karet dolusu, bir karet / fayton dolusu
**coach-horse** [ˈkoutʃhɔ:s] *n* = **coacher**
**coachman** [ˈkoutʃmən] *n* (*pl* **-men** [-mən]) faytonçu, arabaçı
**coach-whip** [ˈkoutʃwɪp] *n* **1.** faytonçu qamçısı; **2.** loskut, parça kəsikləri
**coact** [kouˈækt] *v* birgə hərəkət etmək
**coagulability** [kouˌægjuləˈbɪlɪtɪ] *n* laxtalanma (*qan haq.*)
**coagulable** [kouˈægjuləbl] *adj* laxtalanmağa / qatılaşmağa qabiliyyətli
**coagulate** [kouˈægjuleɪt] *v* qatılaşdırmaq, laxtalandırmaq; qatılaşmaq, laxtalanmaq
**coagulation** [kouˌægjuˈleɪʃn] *n* qatılaşma, qatılanma; laxtalanma
**coagulative** [kouˈægjuleɪtɪv] *adj* laxtalaşan; qatılaşan
**coal¹** [koul] *n* **1.** kömür, daş kömür; **brown ~** boz kömür, liqnit; **hard / anthracite ~** antrasit (*daş kömürün əla növü*); **2.** yanan kömür; kömür parçası; **3.** *pl d.d.* kömür (*yanacaq*); **to lay in ~s for the winter** qışa kömür ehtiyatı görmək;
◊ **to be on hot ~s** ≡ iynə / tikan üstündə oturmaq; **to bear / to carry ~s 1)** ağır işlə məşğul olmaq; **2)** özünün təhqiramiz vəziyyəti ilə razılaşmaq; **to carry ~s to Newcastle** Nyukasla kömür daşımaq / aparmaq; ≡ Naxçıvana duz aparmaq (*yəni mənasız / yararsız işlə məşğul olmaq*)

**coal**[2] [koul] *v* **1.** kömürləşmək, kömürə dönmək / çevrilmək, yanıb kömür olmaq; **2.** kömür yükləmək
**coal-basin** [ˈkoul,beɪsn] *n* daş kömür hövzəsi
**coal-bearing** [ˈkoul,beərɪŋ] *adj* daş kömür olan
**coal-bed** [ˈkoulbed] *n* daş kömür qatı / layı
**coal-black** [ˈkoulˈblæk] *adj* kömür kimi qara
**coal-breaker** [ˈkoul,breɪkəʳ] *n* kömürdoğrayan maşın
**coal-dust** [ˈkouldʌst] *n* kömür tozu / xəkəsi
**coaler** [ˈkouləʳ] *n* **1.** *d.y. dən.* **1.** kömürçü; **2.** kömüryükləyən fəhlə
**coalesce** [,kouəˈles] *v* **1.** birləşmək, bitişmək (*sınmış sümük və s. haq.*)
**coalescence** [,kouəˈlesns] *n* **1.** yapışma, qovuşma, bitişmə, örtülmə (*göz haq.*); **2.** birləşmə (*qruplarda və s.*)
**coalescent** [,kouəˈlesnt] *adj* bitişən, qaynayıb qarışan, yapışan
**coal-face** [ˈkoulfeɪs] *n* kömür kəsmə; kəsilmiş kömürün qədəri
**coal-field** [ˈkoulfi:ld] *n* kömür yatağı
**coal-gas** [ˈkoulˈgæs] *n* işıq qazı
**coal-heaver** [ˈkoul,hi:vəʳ] *n* kömürdaşıyan
**coal-hole** [ˈkoulhoul] *n* kömür saxlamaq üçün zirzəmi
**coal-house** [ˈkoulhaus] *n* kömür anbarı
**coaling-station** [ˈkoulɪŋ,steɪʃn] *n* **1.** *d.y.* kömür yüklənən stansiya; **2.** *dən.* kömür yüklənən liman
**coalition** [,kouəˈlɪʃn] *n* koalisiya, ittifaq, birləşmə; **to form a** ~ koalisiya təşkil etmək; **to enter a** ~ koalisiyaya daxil olmaq
**coalitional** [,kouəˈlɪʃnl] *adj* koalisiya, koalision
**coalitionist** [,kouəˈlɪʃnɪst] *n* koalisiya iştirakçısı
**coalize, -ise** [ˈkouəlaɪz] *v* koalisiya təşkil etmək, koalisiyaya daxil olmaq / girmək
**co-ally** [kouˈælaɪ] *n* müttəfiq
**coalman** [ˈkoulmæn] *n* (*pl* **-men** [-mən]) **1.** qazmaçı, kömürçıxaran (*fəhlə*); **2.** kömür sənayesi sahibi
**coal-mine** [ˈkoulmaɪn] *n* daş kömür şaxtası / mədəni
**coal-miner** [ˈkoul,maɪnəʳ] *n* qazmaçı; kömürçıxaran (*fəhlə*)
**coal-oil** [ˈkoulˈɔɪl] *n* **1.** xam neft; **2.** mineral yağ
**coal-owner** [ˈkoul,ounəʳ] *n* daş kömür şaxtasının sahibi, şaxta sahibi
**coal-pit** [ˈkoulpɪt] *n* = **coal-mine**
**coal-sack** [ˈkoulˈsæk] *n* kömür kisəsi
**coal-tar** [ˈkoulˈta:] *n* daş kömür qətranı
**coaly** [ˈkoulɪ] *adj* **1.** kömürlü, tərkibində kömür olan; **2.** kömür / qətran kimi qara
**coaptation** [,kouæpˈteɪʃn] *n* **1.** uyğunlaşdırma, düzəltmə; **2.** birləşdirmə və ya yaxınlaşdırma (*sınmış sümükləri*)
**coarctate** [kouˈa:kteɪt] *adj* sıx bitişən, sıx əlaqədə olan (*bədən üzvləri və s. haq.*)
**coarse** [kɔ:s] *adj* **1.** qaba, kobud; ~ **clothes** qaba paltar; ~ **food** qaba yemək; ~ **behaviour / joke** kobud rəftar / zarafat; **2.** iri, iridənəli; ~ **sand** iri / iridənəli qum; **3.** kələ-kötür, nahamar; **4.** kobud, tərbiyəsiz, ədəbsiz; ~ **manners** ədəbsiz / kobud xasiyyət; **5.** nalayiq; vulqar; ~ **language** vulqar dil
**coarse-grained** [ˈkɔ:sgreɪnd] *adj* iridənəli
**coarsely** [ˈkɔ:slɪ] *adv* kobud, qaba
**coarsen** [ˈkɔ:sn] *v* **1.** kobudlaşdırmaq, qabalaşdırmaq; **2.** kobud / qaba danışmaq
**coarseness** [ˈkɔ:snɪs] *n* kobudluq, qabalıq, nəzakətsizlik
**coarticulate** [,koua:ˈtɪkjuleɪt] *v* birləşdirmək, bağlamaq
**coast**[1] [koust] *n* dəniz sahili / kənarı; sahil boyu; **on the** ~ dəniz kənarında / sahilində; **flat / steep / rocky** ~ düz / sıldırımlı / qayalı sahil
**coast**[2] [koust] *adj* sahil; **Coast Air Forces** *hərb.* sahil mühafizə aviasiyası; **Coast Defence** *hərb.* sahil mühafizəsi / müdafiəsi; ~ **watch post** *amer.* sahil gözətçi postu;
◊ *The coast is clear Yol açıqdır, Maneə yoxdur*
**coast**[3] [koust] *v* **1.** sahil boyu üzmək; **2.** *amer.* kirşə ilə dağdan sürüşmək; **3.** vəcdə / cuşa gəlmək (*narkotik maddənin və ya musiqinin təsiri ilə*)
**coastal** [ˈkoustəl] *adj* sahil; ~ **waters** sahil suları; ~ **state** sahil boyunda yerləşən ştat; ~ **patrol service** *hərb.* sahil patrul xidməti







**coaster** [ˈkoustəʳ] *n* **1.** sahil gəmisi; **2.** sahil rayonlarının sakini; **3.** *amer.* dağdan sürüşmək üçün kirşə
**coaster break** [ˈkoustəbreɪk] *n tex.* velosipeddə ayaq tormozu / əyləci
**coast-guard**[1] [ˈkoustga:d] *n* **1.** sahil keşikçi dəstəsi; **2.** sahil gömrük mühafizə dəstəsi
**coast-guard**[2] [ˈkoustga:d] *adj* sahil; ~ **station** *hərb.* sahil sərhəd postu / məntəqəsi
**coasting** [ˈkoustɪŋ] *n* **1.** sahil gəmiçiliyi; **2.** *id.* inersiya ilə qaçma
**coasting-trade** [ˈkoustɪŋˈtreɪd] *n* sahil ticarəti
**coasting-vessel** [ˈkoustɪŋˈvesl] *n* sahil gəmisi
**coast-line** [ˈkoustlaɪn] *n* sahil xətti
**coast-man** [ˈkoustmən] *n* (*pl* **-men** [-mən]) sahil zolağında yaşayan sakin
**coast-waiter** [ˈkoust,weɪtəʳ] *n* gömrükxana yoxlayıcısı
**coastwise** [ˈkoustwaɪz] *adv* sahil boyunca; **to sail** ~ sahil boyunca üzmək
**coat**[1] [kout] *n* **1.** pencək; mundir (*rəsmi paltar*); **tail** ~ frak; palto; ~ **and skirt** qadın kostyumu; **2.** xəz, yun; dəri (*heyvan dərisi*); tük, lələk (*quşlarda*); **3.** *anat.* pərdə, qişa; **4.** örtük, qat; ~ **of snow** qar örtüyü; **5.** üz vurma / çəkmə, üz; **to give the walls a second ~ of paint** divarlara ikinci dəfə boya / rəng vurmaq / çəkmək;
◊ **to wear the king's / the queen's** ~ ingilis ordusunda xidmət etmək; **to turn** *one's* ~ əqidəsini dəyişmək, düşmən tərəfə keçmək; **to take off** *one's* ~ dalaşmağa / vuruşmağa hazırlaşmaq; **to cut the / one's ~ according to the / one's cloth** ≅ ayağını yorğanına görə uzatmaq
**coat**[2] [kout] *v* **1.** qatla örtmək; örtülmək, basmaq; **to ~ wood with paint** taxtanı rəngləmək; *The table was coated with / in dust Stolu toz örtmüşdü / basmışdı;* **2.** astarlamaq, astar çəkmək (*rənglə*); **3.** üz çəkmək
**coated** [ˈkoutɪd] *adj* **1.** örtülü, örtülmüş (*bir şeylə*); **pills ~ with sugar** şəkərlə örtülmüş həblər; **2.** üz çəkilmiş
**coating** [ˈkoutɪŋ] *n* **1.** qat, lay; təbəqə (*boya və s. haq.*), örtük; ~ **of white** ağ boya / rəng qatı; **2.** palto tikmək üçün parça
**coat-tail** [ˈkoutteɪl] *n* dal ətək (*sürtükdə, frakda*)
**co-author** [kouˈɔ:θəʳ] *n* həmmüəllif
**coax**[1] [kouks] *n* **1.** yaltaq, qılığa girən (*adam*); **2.** yaltaq nitq
**coax**[2] [kouks] *v* **1.** tovlamaq, ələ almaq, dilə tutmaq; öz tərəfinə çəkmək; **2.** yaltaqlıq / dilə tutma yolu ilə əldə etmək (*nəyisə*); **to ~ *smb.* out of his money** bir kəsdən pul qoparmaq (*tovlamaq, dilə tutmaq yolu ilə*)
**coaxing** [ˈkouksɪŋ] *n* tovlama, dilə tutma, qılığına girmə
**cob**[1] [kɔb] *n* I **1.** erkək qu (*quş*); **2.** *bot.* qarğıdalı qıcasının cecəyi; **3.** qısa qıçlı, alçaq, möhkəm gövdəli at
**cob** [kɔb] *n* II *zool.* qağayı
**cob**[2] [kɔb] *v* **1.** külçəni / filizi əllə parçalamaq / xırdalamaq; **2.** vurmaq, zərbə endirmək; **3.** *dən.* dənizçiyə cəza vermək; **4.** döymək (*taxılı*)
**cobalt** [kəˈbɔ:lt] *n kim.* kobalt
**cobble**[1] [ˈkɔbl] *n* I çay / çaylaq daşı
**cobble** [ˈkɔbl] *n* II kobud / yöndəmsiz yamaq (*ayaqqabıda*)
**cobble**[2] [ˈkɔbl] *v* I yola çay / çaylaq daşı döşəmək
**cobble** [ˈkɔbl] *v* II kobud tərzdə yamamaq (*adət. ayaqqabını*)
**cobbler** [ˈkɔbləʳ] *n* pinəçi (*ayaqqabı yamayan*)
**cobblers** [ˈkɔbləz] *n sl.* cəfəngiyat, boş danışıq
**cobby** [ˈkɔbɪ] *adj* **1.** alçaqboylu, qısaboy, qısaboylu; **2.** özbaşına, kefi istədiyi kimi hərəkət edən, öz bildiyini edən
**cob crusher** [ˈkɔb,krʌʃəʳ] *n k.t.* qarğıdalı təmizləyən maşın (*qarğıdalını dənələyən*)
**co-belligerent** [ˈkɔbɪˈlɪdʒərənt] *n* müttəfiq (*müharibədə*)
**cob-loaf** [ˈkɔblouf] *n* kökə, qoğal
**cob-nut** [ˈkɔbnʌt] *n* **1.** *bot.* fındıq ağacı (*meşədə*); **2.** fındıq (*meyvə*); **3.** qoz-qoz oyunu (*uşaq oyunu*)
**cobra** [ˈkoubrə] *n zool.* kobra, eynəkli ilan
**co-brother** [kouˈbrʌðəʳ] *n* yoldaş, sənət / peşə yoldaşı
**cobweb** [ˈkɔbweb] *n* **1.** hörümçək toru; **2.** *pl* hiylə, kələk, biclik, fırıldaq; **3.** tor, tələ;
◊ ~ **morning** dumanlı səhər
**cobwebbed** [ˈkɔbwebd] *adj* torla örtülmüş
**cobweb bird** [ˈkɔbwebˈbə:d] *n zool.* milçəktutan (*quş*)

**coca** [ˈkoukə] *n bot.* koka, kokain ağacı
**Coca-Cola** [ˈkoukəˈkoulə] *n* koka-kola
**cocaine**[1] [kəˈkeɪn] *n əcz.* kokain (*narkotik maddə*)
**cocaine**[2] [kəˈkeɪn] *adj* kokain
**cocainize** [kəˈkeɪnaɪz] *v* kokain vurmaq (*iynə ilə*)
**co-chairman** [ˈkouˈtʃeəmən] *n* (*pl* **-men** [-mən]) həmsədr, sədrlərdən biri
**cock**[1] [kɔk] *n* I **1.** xoruz; **fighting** ~ döyüşən xoruz; **2.** xoruz banı; **3.** hərdəmxəyal / fikrini tez-tez dəyişən adam; **4.** *d.d.* davakar, dalaşqan adam; ~ **of the school** məktəbdə ən davakar (*şagird*); **5.** *hərb.* tətik (*silahda*); **6.** *av.* təyyarəçinin oturduğu yer; **7.** *tabu.* cinsi orqan (*kişilərdə*), penis; ◊ **old** ~ dost; ~ **of the walk**, ~ **of the dunghill 1)** vacib adam / şəxs; **2)** vəziyyətin sahibi; **to live like a fighting** ~ dəbdəbə / cah-calal içərisində yaşamaq; ~ **and bull story / tale** uydurma, yalan, yalan-palan
**cock** [kɔk] *n* II yuxarı ayağa qoyulmuş / yuxarı qaldırılmış tətik (*silahda*)
**cock** [kɔk] *n* III xotma, taya
**cock** [kɔk] *n* IV mənalı / təsirli hərəkət
**cock**[2] [kɔk] *v* I **1.** qaldırmaq, şəkləmək (*qulağı: heyvan haq.*); **to** ~ **the ears** qulaqların şəkləmək (*heyvan haq.*); **to** ~ **the hat** papağı yan / çəp qoymaq; **2.** xoruz öyrətmək;
◊ **to** ~ ***one's*** **nose** ölmək
**cock** [kɔk] *v* II tətiyi yuxarı ayağa qoymaq / qaldırmaq
**cock** [kɔk] *v* III taya / xotma vurmaq (*quru otdan*)
**cockade** [ˈkɔˈkeɪd] *n* kokarda (*rəsmi papaqlara vurulan dəmir nişan*)
**cock-a-doodle-doo** [ˈkɔkədu:dlˈdu:] *n* quqqulu-qu (*xoruz banlaması*)
**cock-crow** [ˈkɔkkrou] *n* **1.** xoruz banı (*səs*); **2.** *məc.* şəfəq, dan yeri
**cock-crowing** [ˈkɔkkrouɪŋ] *n* = **cock-crow**
**cocked** [kɔkt] *adj* yuxarı qatlanmış / əyilmiş; ~ **hat** yanları yuxarı qatlanmış üçkünclü şlyapa
**cocker**[1] [ˈkɔkəʳ] *n* I **1.** xoruz döyüşü həvəskarı; **2.** döyüşən xoruz sahibi; **3.** kokers-panel (*ov iti*)
**cocker** [ˈkɔkəʳ] *n* II tayavuran (*adam*)
**cocker**[2] [ˈkɔkəʳ] *v* oxşamaq, əzizləmək, nazlamaq; nəvaziş göstərmək, ərköyün böyütmək (*uşağı*)
**cockerel** [ˈkɔkərəl] *n* beçə
**cock-eye** [ˈkɔkaɪ] *n* çəpgöz (*adam*)
**cock-eyed** [ˈkɔkaɪd] *adj* **1.** çəpgöz, çaş; **2.** sərxoş, kefli
**cock-fight** [ˈkɔkfaɪt] *n* xoruz döyüşü
**cock-fighting** [ˈkɔk,faɪtɪŋ] *n* xoruz döyüşməsi
**cock-horse** [ˈkɔkˈhɔ:s] *n* **1.** oyuncaq at; **2.** böyük yekəpər at; ayğır;
◊ **to ride a** ~ lovğalanmaq, iddia satmaq, özünü öymək
**cockle** [ˈkɔkl] *v* **1.** bürüşmək, qırışmaq; qırışla örtülmək; əyilmək, qabarmaq (*istidən, nəmdən; kağız, cild və s.*); **2.** köpüklü dalğalarla örtülmək (*dəniz haq.*)
**cockle-stairs** [ˈkɔklsteəz] *n pl* dolama pilləkən
**cockney** [ˈkɔknɪ] *n* **1.** kokni (*Londonda danışılan loru dil*); **2.** Londonlu (*xüs. şərq hissədə yaşayan*)
**cockpit** [ˈkɔkpɪt] *n* **1.** xoruz döyüşü üçün meydan; **2.** *dən.* kubrik (*gəmidə alt paluba*); **3.** *av.* açıq kabinə; **4.** açıq kuzov (*yarış avtomobilində*)
**cockroach** [ˈkɔkroutʃ] *n* tarakan
**cockscomb** [ˈkɔkskoum] *n* **1.** xoruz pipiyi; **2.** təlxək papağı
**cock-shut** [ˈkɔkʃʌt] *adj* toran; ~ **light / time** toran, toyuqların tarlanan / tara yığılan vaxtı
**cockspur** [ˈkɔkspə:ʳ] *n bot.* yemişan
**cock-sure** [ˈkɔkˈʃuəʳ] *adj d.d.* **1.** (**of, about**) əmin, arxayın, xatircəm, inanmış; **2.** özünə qürrələnən / güvənən / inanan / arxayın olan; **3.** labüd, qaçılmaz, zəruri (*hadisə haq.*)
**cocksy** [ˈkɔksɪ] *adj* **1.** özünə qürrələnən / güvənən; **2.** cəsarətli, ürəkli, ötkəm; **3.** sırtıq, utanmaz, abırsız, həyasız, ədəbsiz
**cocktail** [ˈkɔkteɪl] *n* **1.** kokteyl; **2.** quyruğu kəsilmiş at; **3.** bambılı, layiq olmadığı mövqeyi tutan adam
**cock-tailed** [ˈkɔkteɪld] *adj* quyruğu kəsilmiş (*at haq.*)
**cockweed** [ˈkɔkwi:d] *n bot.* vəzəri, acıtərə





**cocky** [ˈkɔkɪ] *adj: d.d.* ədəbsiz, qaba, kobud, sözqaytaran
**coco** [ˈkoukou] *n bot.* **1.** hind qozu ağacı; **2.** hind qozu (*meyvə*)
**cocoa** [ˈkoukou] *n* **1.** kakao; **2.** kakao içkisi
**cocoa bean** [ˈkoukouˈbɪ:n] *n* kakao paxlası
**cocoa nib** [ˈkouˈkouˈnɪb] *n* qabıqdan çıxarılmış kakao dənəsi
**cocoa powder** [ˈkoukouˈpaudəʳ] *n* boz barıt
**coconut** [ˈkoukənʌt] *n* hind qozu
**coconut tree** [ˈkoukənʌtˈtri:] *n* hind qozu ağacı
**cocoon**[1] [kəˈku:n] *n* barama
**cocoon**[2] [kəˈku:n] *v* barama istehsal etmək
**cocotte** [kəˈkɔt] *n fr.* yüngülxasiyyətli qadın, fahişə
**coddle**[1] [ˈkɔdl] *n d.d.* ərköyün, nazlı; nadinc, dəcəl, ərköyün uşaq
**coddle**[2] [ˈkɔdl] *v* I qulluq etmək, baxmaq (*xəstəyə və s.*); nazlamaq, nazı ilə oynamaq
**coddle** [ˈkɔdl] *v* II qaynatmadan yavaş-yavaş bişirmək (*xüs. meyvəni*)
**code**[1] [koud] *n* **1.** kodeks; **civil** ~ mülki kodeks; **criminal** ~ cinayət kodeksi; ~ **of commerce** ticarət kodeksi; **2.** qanunlar, qaydalar, prinsiplər (*əxlaq, şərəf və s. haq.*); **moral** ~ əxlaq qaydaları; **3.** kod; (*şərti ixtisarlar sistemi*); **Morse** ~ Morze kodu; **telegraphic** ~ teleqraf kodu
**code**[2] [koud] *v* **1.** kodifikasiya etmək, kodeks halına / sistemə salmaq (*qanunları*); **2.** kodlamaq, şifrələmək
**co-debtor** [kouˈdetəʳ] *n hüq.* borc şəriki / ortağı
**co-defendant** [ˈkoudɪˈfendənt] *n hüq.* başqası ilə birlikdə cavabdeh olan (*şəxs*)
**codeine** [ˈkoudi:n] *n əcz.* kodein (*ağrıkəsən dərman*)
**co-education** [ˈkou,edju:ˈkeɪʃn] *n* oğlan və qızların birgə təhsil alması
**co-educational** [ˈkou,edju:ˈkeɪʃnl] *adj* birgə təhsilə (*oğlanlarla qızların*) aid olan; birgə təhsil; ~ **system** birgə təhsil sistemi
**coefficient**[1] [,kouɪˈfɪʃənt] *n* **1.** əmsal; ~ **of efficiency** faydalı iş əmsalı; ~ **of expansion** genişlənmə əmsalı; **2.** təsiredici faktor
**coefficient**[2] [,kouɪˈfɪʃənt] *adj* təsiredici, təsir göstərən
**coenobite** [ˈsi:nəbaɪt] *n* rahib; zahid, asket
**coenoby** [ˈsi:nəbɪ] *n* monastır
**coequal** [kouˈɪ:kwəl] *adj* başqasına bərabər (*rütbəcə və s.*)
**coerce** [kouˈə:s] *v* **1.** tutmaq, saxlamaq, tutub saxlamaq; **2.** məcbur / vadar etmək; **to** ~ ***smb.*** **into silence** bir kəsi susmağa məcbur / vadar etmək; **to** ~ ***smb.*** **to sign a document** bir kəsi bir sənədə qol çəkməyə məcbur / vadar etmək
**coercion** [kouˈə:ʃn] *n* **1.** saxlama, tutub saxlama (*güclə*); cilovlama; **2.** məcbur / vadar etmə; **3.** iğtişaşın / qarışıqlığın qarşısını almaq üçün zor işlətmə
**coercive** [kouˈə:sɪv] *adj* məcburi, icbari; ~ **methods** məcburi / icbari metodlar
**coeval**[1] [kouˈi:vəl] *n* **1.** yaşıd, həmyaş; **2.** həməsr, bir əsrin / dövrün adamı
**coeval**[2] [kouˈi:vəl] *adj* **1.** eyni vaxtda baş verən / mövcud olan; *The custom is coeval with Christianity in England Bu adət İngiltərədə xristianlıqla eyni vaxtda yaranıb;* **2.** eyniyaşlı, həmyaş, yaşıd
**co-exist** [ˈkouɪgˈzɪst] *v* (**with, together with**) bir yerdə yaşamaq, yanaşı yaşamaq
**coexistence** [ˈkouɪgˈzɪstəns] *n* bir yerdə yaşama, yan-yana / yanaşı yaşama; **peaceful** ~ dinc yanaşı yaşama
**coexistent** [ˈkouɪgˈzɪstənt] *adj* bir yerdə yaşayan, yan-yana / yanaşı yaşayan
**coffee** [ˈkɔfɪ] *n* **1.** qəhvə; **black** ~ qara qəhvə; **white** ~ südlü qəhvə; **2.** bir fincan qəhvə; *We'll have two coffees, please Zəhmət olmasa, bizə iki fincan qəhvə verin;*
◊ ~ **cooler** özünü işə verməyən adam, asan yolla pul qazanmaq istəyən adam
**coffee-bean** [ˈkɔfɪˈbi:n] *n* qəhvə paxlası
**coffee-berry** [ˈkɔfɪˈberɪ] *n bot.* qəhvə ağacı / meyvəsi
**coffee-cup** [ˈkɔfɪkʌp] *n* qəhvə fincanı
**coffee-grinder** [ˈkɔfɪ,graɪndəʳ] *n* qəhvəüyüdən maşın
**coffee-house** [ˈkɔfɪhaus] *n* qəhvəxana, kafe
**coffee-mill** [ˈkɔfɪmɪl] *n* qəhvə dəyirmanı, qəhvəüyüdən
**coffee-palace** [ˈkɔfɪ,pælɪs] *n* = **coffee-house**
**coffee-pot** [ˈkɔfɪpɔt] *n* qəhvədan, qəhvə bişirilən qab
**coffee-room** [ˈkɔfɪru:m] *n* kafe, ümumi yeməkxana (*mehmanxanada*)

**inhumane** [,ɪnhju:'meɪn] *adj* insaniyyətsiz, vəhşi, insafsız

**inimical** [ɪ'nɪmɪkl] *adj* düşmən, düşməncəsinə; **~ to one another** bir-birinə düşmən

**inimitable** [ɪ'nɪmɪtəbl] *adj* misilsiz, tayı-bərabəri olmayan; təkraredilməz

**iniquitous** [ɪ'nɪkwɪtəs] *adj* dəhşətli, qorxulu, qorxunc, müdhiş; ədalətsiz, insafsız, haqsız; **~ punishment** haqsız cəza; **an ~ decision** ədalətsiz qərar

**initial**[1] [ɪ'nɪʃl] *n* (*adət. pl*) inisial (*ad, soy və ya ata adının baş hərfləri*); *John Fitzgerald Kennedy was well-known by his initials JFK Con Ficerald Kennedi özünün CFK inisialı ilə məşhur idi; Just write your initials Ancaq inisiallarını / inisiallarınızı yaz / yazın*

**initial**[2] [ɪ'nɪʃl] *adj* birinci, əvvəlinci, əvvəlki, ən birinci, ilk; **~ attempt** ilk cəhd

**initial**[3] [ɪ'nɪʃl] *v* inisiallarını yazmaq; imza əvəzinə inisiallarını yazmaq; **to ~ a note** məktuba inisiallarını yazmaq

**initiate** [ɪ'nɪʃɪeɪt] *v* **1.** başlamaq; girişmək, qoşulmaq; **to ~ discussions / social reforms** müzakirələrə / ictimai islahatlara başlamaq; **2.** təşəbbüs göstərmək; təklif etmək; **3.** (**into**) tanış etmək, öyrətmək (*elm, sənət və s.*); **to ~ a pupil into the elements of grammar** şagirdi qrammatikanın əsasları ilə tanış etmək

**initiative** [ɪ'nɪʃɪətɪv] *n* təşəbbüs; **to do *smth.* on *one's* own ~** bir şeyi öz təşəbbüsü ilə etmək; **to take the ~ in doing *smth.*** bir şeyi etməkdə təşəbbüsü öz əlinə almaq

**inject** [ɪn'dʒekt] *v* yeritmək, vurmaq (*iynə*); **to ~ oneself with insulin** özünə insulin vurmaq; **to ~ penicillin into *smb.*** bir kəsə penisillin vurmaq

**injection** [ɪn'dʒekʃn] *n* inyeksiya (*iynə vurma*)

**injudicious** [,ɪndʒu'dɪʃəs] *adj* ağılsız, düşüncəsiz; yersiz; **~ actions** yersiz hərəkətlər

**injunction** [ɪn'dʒʌŋkʃn] *n* əmr, sərəncam, göstəriş; **to obey the ~s** əmrlərə əməl etmək

**injure** ['ɪndʒəʳ] *v* **1.** əzmək, zədələmək, yaralamaq; **to ~ *one's* knee / leg with *smth.*** bir şeylə dizini / qıçını əzmək / zədələmək / yaralamaq; **2.** xətirə dəymək, könül sındırmaq; **to ~ *smb.'s* feelings** bir kəsin heysiyyatına toxunmaq

**injurious** [ɪn'dʒuərɪəs] *adj* ziyanlı, zərərli, xatalı, xətərli, öldürücü; **~ to health** sağlamlıq üçün ziyanlı / zərərli

**injury** ['ɪndʒərɪ] *n* **1.** bədən xəsarəti, əzik, yara; **to inflict injuries on *smb.*** bir kəsə bədən xəsarəti yetirmək; **to sustain injuries** əlil / şikəst olmaq; **2.** zərər, ziyan, itki; **~ by fire** yanğının verdiyi ziyan

**injustice** [ɪn'dʒʌstɪs] *n* ədalətsizlik, insafsızlıq, haqsızlıq; **to do *smb.* an ~** bir kəsə qarşı ədalətsizlik etmək

**ink** [ɪŋk] *n* mürəkkəb; **to write in ~** mürəkkəblə yazmaq

**inky** ['ɪŋkɪ] *adj* mürəkkəbli, mürəkkəbə batmış; **~ fingers** mürəkkəbə batmış barmaqlar

**inland**[2] ['ɪnlənd] *adj* **1.** ölkədaxili; ölkənin içərilərində yerləşən, dənizdən və ya sərhəddən uzaq; **~ town** ölkədaxili şəhər, ölkənin içərilərində yerləşən şəhər; **2.** daxili (*ticarət və s. haq.*); **~ trade** daxili ticarət

**inland**[3] [ɪn'lænd] *adv* **1.** içinə, içərilərinə, içərilərə; **to go ~** ölkənin içərilərinə getmək; **2.** ölkənin içərilərində; **to live ~** dənizdən və ya sərhəddən uzaq rayonda / ölkənin içərilərində yaşamaq

**in-law** ['ɪnlɔ:] *n* (*adət. pl*) *d.d.* ər qohumları, arvad qohumları

**inlay** ['ɪnleɪ] *n* mozaik iş; parket döşəmə

**inlet**[1] ['ɪnlet] *n* nazik dəniz körfəzi

**inmate** ['ɪnmeɪt] *n* sakin, yaşayan (*xüs. həbsxanada, monastırda və s.-də*); **the ~s of a hospital** xəstəxanada olan xəstələr

**inmost** ['ɪnmoust] *adj* **1.** ən dərin; ən uzaq; **the ~ centre of the earth** yerin ən dərin mərkəzində; **2.** ən gizli / məxfi, gizli saxlanan; **~ feelings / thoughts** ən gizli hisslər / fikirlər

**inn** [ɪn] *n* mehmanxana; karvansara; **to be at an ~** mehmanxanada qalmaq; **to put up / to stop at an ~** mehmanxanaya düşmək

**innards** ['ɪnədz] *n pl* daxili hissələr / orqanlar, içalat; **turkey ~** hinduşka içalatı

**innate** [,ɪ'neɪt] *adj* anadangəlmə, fitri, təbii; **~ ability** anadangəlmə qabiliyyət





**inner** ['ɪnəʳ] *adj* **1.** iç, daxili; **~ door / room** iç / içəri qapı / otaq; **2.** gizli, intim; **~ thoughts** gizli fikirlər

**innkeeper** ['ɪn,ki:pəʳ] *n* mehmanxana sahibi; aşxana sahibi

**innocence** ['ɪnəsns] *n* günahsızlıq, təqsirsizlik; məsumluq; **to prove *one's* ~ of a crime** özünün cinayətdə əli olmadığını sübut etmək

**innocent**[2] ['ɪnəsnt] *adj* **1.** günahsız, taqsırsız; məsum; təmiz; **~ babe** məsum körpə; **~ life** təmiz; **to be ~ of the crime** cinayətdə əli olmamaq; **2.** sadə, sadəlövh, ürəyiaçıq, hiyləsiz; **an ~ girl** sadəlövh qız; **an ~ man** sadəlövh adam

**innocuous** [ɪ'nɔkjuəs] *adj* zərərsiz, ziyansız, xatasız, xətərsiz; **~ snake** xətərsiz ilan; **an ~ remark** zərərsiz məzəmmət / töhmət

**innovate** ['ɪnəveɪt] *v* yenilik tətbiq etmək, yenilik gətirmək (*yeni metod, fikir və s. haq.*)

**innovation** [,ɪnə'veɪʃn] *n* yenilik; **an ~ in technology** texnologiyada yenilik

**innovator** ['ɪnə'veɪtəʳ] *n* novator, yenilik gətirən, yenilik tətbiq edən

**innumerable** [ɪ'nju:mərəbl] *adj* hədsiz, saysız-hesabsız, son dərəcə çox, sayahesaba gəlməyən; çox saylı ordu; **~ books** son dərəcə çox sayda kitablar; **~ opportunities** saysız-hesabsız imkanlar

**inoculate** [ɪ'nɔkjuleɪt] *v* peyvənd etmək (*müəyyən xəstəliyə qarşı*); **to ~ *smb.* against cholera** bir kəsə vəbaya qarşı peyvənd etmək

**inoculation** [,ɪnɔkju'leɪʃn] *n tib.* peyvənd

**inoffensive** [,ɪnə'fensɪv] *adj* zərərsiz, ziyansız; üzüyola, dinc, sakit; **an ~ person** üzüyola adam

**inoperable** [ɪn'ɔprəbl] *adj tib.* müalicəsiz, müalicəsi olmayan; **~ case** müalicəsi olmayan xəstəlik

**inoperative** [ɪn'ɔpərətɪv] *adj* təsir göstərməyən, təsiri olmayan

**inopportune** [ɪn'ɔpətju:n] *adj* vaxtsız, yersiz; münasib olmayan, yaramayan; **~ demands** yersiz tələblər

**inordinate** [ɪn'ɔ:dɪnət] *adj* həddən artıq / çox, hədsiz; **an ~ amount of time** həddən çox vaxt

**inorganic** [,ɪnɔ:'gænɪk] *adj* qeyri-üzvi; cansız

**in-patient** ['ɪn,peɪʃnt] *n* stasionar xəstə

**input** ['ɪnput] *n* kompyuterə informasiya daxil etmə

**inquest** ['ɪŋkwest] *n* *hüq.* sorğu-sual, dindirmə, istintaq;
◊ **great / last / solemn ~** *din.* qiyamət / məhşər günü

**inquire** (*həm də* **enquire**) [ɪn'kwaɪəʳ] *v* soruşmaq, xəbər almaq; öyrənmək; **to ~ *smb.'s* name** bir kəsin adını soruşmaq; **to ~ the way** yolu soruşmaq

**inquiring** [ɪn'kwaɪərɪŋ] *adj* sualedici, sualverici; yalvarıcı; **~ look** sualedici / yalvarıcı baxış

**inquiry** [ɪn'kwaɪərɪ] *n* **1.** sual, sorğu; **reasonable ~** ağıllı sual; **a letter of ~** yazılı sorğu; **to reply to inquiries** sorğulara cavab vermək; **2.** *hüq.* istintaq; **to renew the ~** istintaqa yenidən başlamaq

**inquisition** [,ɪnkwɪ'zɪʃn] *n* **1.** araşdırma, öyrənmə, tədqiq etmə; tədqiqat; **earnest ~** ciddi tədqiqat; **2.** *hüq.* istintaq, istintaq aparma; **to set on foot a careful ~** mükəmməl istintaqa başlamaq

**inquisitive** [ɪn'kwɪzɪtɪv] *adj* hər şeylə maraqlanan, hər şeyi bilmək istəyən; **a very ~ child** hər şeylə maraqlanan uşaq

**inroad** ['ɪnroud] *n* **1.** basqın, qəfil hücum, yürüş, soxulma; **plundering ~s** soyğunçuluq basqınları; **to make an ~ into / upon a country** ölkəyə basqın / yürüş / hücum etmək; **2.** (*əsas. pl*) qəsd, qəsd etmə, əl uzatma; **~s upon *smb.'s* time** bir kəsin vaxtını alma

**insane** [ɪn'seɪn] *adj* **1.** ruhi xəstə, divanə, dəli; ağılsız, anormal; **~ person** anormal / dəli adam; **2.** axmaq, sarsaq; cəfəng, mənasız; **~ desire** axmaq arzu; **a hospital for the ~** ruhi xəstələr üçün xəstəxana

**insanitary** [ɪn'sænɪtrɪ] *adj* çirkli, natəmiz, səhiyyə tələblərinə cavab verməyən; **~ living conditions** natəmiz / antisanitar yaşayış şəraiti

**insanity** [ɪn'sænɪtɪ] *n* ruhi xəstəlik, ağılsızlıq; dəlilik; **signs of ~** dəliliyin əlamətləri / nişanələri

**insatiable** [ɪn'seɪʃəbl] *adj* acgöz, tamahkar, haris; sönməz; **an ~ desire** sönməz arzu

**inscribe** [ɪnˈskraɪb] *v* **1.** **(in, on)** üstünə / üstündə yazmaq; **to ~ *one's* name in a book** adını kitabın üstünə yazmaq (*bir kəsə it-haf edəndə və ya bağışlayanda*); **2.** həkk etmək; **to ~ a fact / a verse on *one's* memory** faktı / şeri yaddaşına həkk etmək
**inscription** [ɪnˈskrɪpʃn] *n* yazı; kitabə (*daş, metal, ağac və s. üzərində yazılmış qədim yazı*)
**inscrutable** [ɪnˈskru:təbl] *adj* anlaşılmaz, dərkedilməz, ağlasığmaz; gizli; **~ facts** anlaşılmaz faktlar; **~ mystery** anlaşılmaz sirr
**insect** [ˈɪnsekt] *n* **1.** həşərat, cücü
**insecticide** [ɪnˈsektɪsaɪd] *n* həşərat qırmaq üçün vasitə / dərman
**insecure** [ˌɪnsɪˈkjuə] *adj* **1.** təhlükəli, qorxulu, xatalı; **~ position** təhlükəli vəziyyət; **2.** davamsız, tezsınan; **~ ladder** davamsız nərdivan
**inseminate** [ɪnˈsemɪneɪt] *v* mayalandırmaq, döllənd irmək; **to ~ a cow** inəyi mayalandırmaq
**insemination** [ɪnˌsemɪˈneɪʃn] *n* mayalama, mayalandırma, döllənd irmə; **artificial ~** süni mayalandırma
**insensible** [ɪnˈsensəbl] *adj* **1.** hissiz, duyğusuz, qeyri-həssas; hiss etməyən; **~ to pain / to cold, *etc.*** ağrını / soyuğu və s. hiss etməyən; **2.** hissini itirmiş, huşsuz; **to be ~ from pain** ağrıdan huşunu itirmək; **to fall (down) ~** huşsuz vəziyyətdə yıxılmaq
**insensitive** [ɪnˈsensətɪv] *adj* **1.** qeyri-həssas, həssas olmayan; **~ to light** işığa qarşı qeyri-həssas; **2.** laqeyd, etinasız; **~ to beauty** gözəlliyə etinasız
**inseparable** [ɪnˈsepərəbl] *adj* ayrılmaz, ayrılması mümkün olmayan; qırılmaz, möhkəm; **~ union** möhkəm / qırılmaz ittifaq; **~ friends** ayrılmaz dostlar
**insert¹** [ˈɪnsə:t] *n* əlavə, əlavə vərəq, qoşma (*xüs. kitaba, qəzetə*); **an eight-page ~** səkkiz səhifəlik əlavə
**insert²** [ɪnˈsə:t] *v* **1.** əlavə etmək; **to ~ a letter into a word** sözə hərf əlavə etmək; **2.** salmaq; **to ~ a key in a lock** qıfıla açar salmaq
**inset¹** [ˈɪnset] *n* əlavə vərəq (*qəzetdə və ya kitabda*); içəri yapışdırılmış vərəq və s. (*kitabda və s.*)
**inset²** [ˈɪnˈset] *v* salmaq, taxmaq; yerləşdirmək, qoymaq
**inside¹** [ˈɪnˈsaɪd] *n* **1.** daxili məkan / hissə; **the ~ of a room** otağın daxili; **2.** astar, astar tərəf, tərs üz; **the ~ of a hat** şlyapanın astarı / tərs üzü; **3.** *pl* içalat; **the ~s of a fowl** quşun içalatı
**inside²** [ˌɪnˈsaɪd] *adj* daxili, iç; **the ~ pages of a newspaper** qəzetin səhifələri
**inside³** [ˌɪnˈsaɪd] *adv* **1.** içəri, içəridə; *The children are playing inside because it's cold Uşaqlar içəridə oynayırlar, çünki soyuqdur*; **to look ~** içinə baxmaq; **2.** *məc.* daxilən; *I was angry inside but pretended not to care Mən daxilən acıqlı idim, lakin özümü o yerə qoymadım*
**inside⁴** [ˌɪnˈsaɪd] *prep* ...içinə, ...içərisinə, ...daxilinə; ...içində, ...içərisində, ...daxilində; **~ the room** otağın içərisində; **to go ~ the house** evin içərisinə getmək
**inside out** [ˈɪnˈsaɪdaut] *adv* tərsinə, tərs üzünə; **to put *smth.* on ~** bir şeyi tərsinə geymək
**insidious** [ɪnˈsɪdɪəs] *adj* **1.** bic, hiyləgər, məkrli; xain; **~ foe / enemy** xain düşmən; **2.** gözəgörünməyən, gizli; **~ disease** gizli xəstəlik
**insight** [ɪnˈsaɪt] *n* fərasət, ağıllılıq, gözüaçıqlıq; **a man of ~** gözüaçıq adam; **to be endowed with ~** ağıllı / fərasətli olmaq
**insignificance** [ˌɪnsɪgˈnɪfɪkəns] *n* azlıq, cüzilik; əhəmiyyətsizlik, az əhəmiyyətlilik; **the ~ of the problem** problemin əhəmiyyətsizliyi
**insignificant** [ˌɪnsɪgˈnɪfɪkənt] *adj* cüzi; əhəmiyyətsiz, əhəmiyyəti az olan; **~ loss** cüzi itki
**insincere** [ˌɪnsɪnˈsɪə] *adj* qeyri-səmimi, ikiüzlü, riyakar; **~ declaration** qeyri-səmimi bəyanat
**insincerity** [ˌɪnsɪnˈserətɪ] *n* riyakarlıq, qeyri-səmimilik
**insinuate** [ɪnˈsɪnjueɪt] *v* **1.** eyham vurmaq, söz atmaq, işarə etmək; **to ~ that *smb.* has acted wrongly** bir kəsin səhv hərəkət etdiyinə eyham vurmaq; **2.** gözə girmək, özünü gözə soxmaq, qılığa girmək; **to ~ oneself into *smb.'s* confidence** bir kəsin qılığına girmək





**insipid** [ɪnˈsɪpɪd] *adj* **1.** dadsız, ləzzətsiz, şit; **~ food** dadsız yemək; **2.** maraqsız; **~ conversation** maraqsız söhbət
**insist** [ɪnˈsɪst] *v* **(on)** təkid / israr etmək, sözünün üstündə durmaq; **to ~ on the importance of *smth.*** bir şeyin vacibliyinə təkid etmək
**insistence** [ɪnˈsɪstəns] *n* inad, israr, səbat, sözünün üstündə durma
**insistent** [ɪnˈsɪstənt] *adj* inadlı, təkidli, sözünün üstündə duran, inadcıl; **to be ~ on doing *smth.*** bir şeyi etməkdə inadlı / israrlı olmaq
**insole** [ˈɪnsoul] *n* içlik (*ayaqqabıda*)
**insolence** [ˈɪnsələns] *n* həyasızlıq, sırtıqlıq, abırsızlıq
**insolent** [ˈɪnsələnt] *adj* sırtıq, utanmaz, abırsız; **~ behaviour** utanmaz davranış
**insoluble** [ɪnˈsɔljubl] *n* **1.** əriməyən, həll olunmayan; **~ substance** əriməyən maddə; **~ in water** suda əriməyən / həll olmayan; **2.** həll edilməz, həll edilə bilməyən; **~ problem** həlledilməz problem
**insolvent** [ɪnˈsɔlvənt] *adj* borcunu ödəyə / verə bilməyən, müflisləşmiş
**insomnia** [ɪnˈsɔmnɪə] *n* yuxusuzluq
**inspect** [ɪnˈspekt] *v* **1.** diqqətlə yoxlamaq; **to ~ goods / food** əmtəələri / ərzağı diqqətlə yoxlamaq; **2.** təftiş etmək, yoxlamaq; **to ~ a school** məktəbi yoxlamaq
**inspector** [ɪnˈspektəʳ] *n* inspektor, müfəttiş; revizor
**inspiration** [ˌɪnspəˈreɪʃn] *n* ilham, təb; ruhlanma; ruh yüksəkliyi; **to draw / to get / to drive ~ from *smth.*** bir şeydən ilham almaq
**inspire** [ɪnˈspaɪəʳ] *v* **1.** təlqin / təsir etmək; oyatmaq, yaratmaq (*fikir, hiss və s.*); **to ~ *smb.* with hope** bir kəsdə ümid yaratmaq; **2.** ruhlandırmaq, ilham / stimul vermək; **to ~ the audience** dinləyiciləri ruhlandırmaq
**instability** [ˌɪnstəˈbɪlɪtɪ] *n* səbatsızlıq, qərarsızlıq, dəyişkənlik; **financial ~** maliyyə dəyişkənliyi
**install** [ɪnˈstɔ:l] *v* **1.** rəsmi olaraq vəzifəyə qoymaq; **to ~ a judge** hakimi rəsmi olaraq vəzifəyə qoymaq; **2.** *tex.* qurmaq, quraşdırmaq, düzəltmək; **to ~ a heating system** qızdırıcı sistem quraşdırmaq
**installation** [ˌɪnstəˈleɪʃn] *n* **1.** rəsmi olaraq vəzifəyə qoyma / gətirmə; **2.** qurğu, cihaz; **military ~s** hərbi qurğular
**instalment** (*amer.* **installment**) [ɪnˈstɔ:lmənt] *n* **1.** növbəti üzvlük haqqı (*möhlətlə alınan şeyin pulunu ödəyərkən*); hissə-hissə ödəmə; **to pay by / in ~s** hissə-hissə ödəmək; **2.** ayrıca buraxılış (*kitab və s. haq.*); **a novel published in / by ~** ayrıca buraxılışla nəşr edilmiş roman; **3.** hissə, bir partiya (*müəyyən miqdar mal*); **the first ~ of the goods ordered** sifariş edilmiş malın birinci partiyası
**instance** [ˈɪnstəns] *n* **1.** nümunə, örnək, misal; xüsusi hadisə / hal; **to give / to cite an ~ or two** bir və ya iki misal vermək; **2.** tələb; (qətiyyətli) xahiş; təkid, israr; **at the ~ of *smb.*, at *smb.'s* ~** bir kəsin tələbilə
**instant** [ˈɪnstənt] *adj* **1.** dərhal, cəld, təcili; ani; **~ response** təcili cavab; **2.** tez, bir anda hazırlanan (*yemək, içmək haq.*); **~ coffee** dərhal həll olunan kofe / qəhvə; **3.** çox lazımlı / zəruri / gərəkli; **to be in ~ need of *smth.*** bir şeyə çox ehtiyac hiss etmək
**instantaneous** [ˌɪnstənˈteɪnɪəs] *adj* təcili, təxirəsalınmaz; **~ reply** təxirəsalınmaz cavab
**instead** [ɪnˈsted] *adv* əvəzinə, yerinə; *Stuard was ill so I went instead Stuard xəstə idi, buna görə də onun əvəzinə mən getdim*
**instead of** [ɪnˈstedəv] *prep* əvəzinə, yerinə; **~ him** onun əvəzinə / yerinə
**instep** [ˈɪnstep] *n* ayağın / ayaqqabının üst tərəfi
**instigate** [ˈɪnstɪgeɪt] *v* **1.** **(to)** təhrik / sövq / vadar etmək; **to ~ *smb.* to do *smth.*** bir kəsi bir şey etməyə təhrik etmək; **2.** qızışdırmaq, fitnələmək; **to ~ war** müharibəyə qızışdırmaq
**instigation** [ˌɪnstɪˈgeɪʃn] *n* təhrikçilik, qızışdırıcılıq; **at / by the ~ of *smb.*** bir kəsin təhrikçiliyi ilə
**instil** (*amer.* **instill** [ɪnˈstɪl] *v* təlqin etmək; doğurmaq, yaratmaq (*qorxu və s.*); **to ~ (a) love for *smth.*** bir şeyə qarşı məhəbbət yaratmaq;
**instinct** [ˈɪnstɪŋkt] *n* instinkt, təbii hiss; **to do *smth.* by ~** bir işi intuisiya ilə görmək;

**to be endowed with** ~ təbii hiss etmə / duyma qabiliyyəti verilmək

**instinctive** [ɪnsˈtɪŋktɪv] *adj* instinktiv, qeyri-iradi; ~ **movement** instinktiv / qeyri-iradi hərəkət

**institute**[1] [ˈɪnstɪtju:t] *n* **1.** institut, elmi-tədqiqat müəssisəsi, tədris müəssisəsi; **Institute of Technology** Texnologiya institutu; **2.** cəmiyyət, birlik, ittifaq

**institute**[2] [ˈɪnstɪtju:t] *v* əsasını qoymaq, təsis etmək; **to ~ a government** hökumət qurmaq

**institution** [ˌɪnstɪˈtju:ʃn] *n* cəmiyyət, təşkilat, müəssisə, idarə; birlik; **charitable** ~ xeyriyyə müəssisəsi

**instruct** [ɪnˈstrʌkt] *v* **1.** öyrətmək; **to ~ a child** uşağı öyrətmək; **to ~ *smb.* in history / in geography, *etc.*** bir kəsə tarixi, coğrafiyanı və s. öyrətmək; **2.** təlimatlandırmaq, təlimat / göstəriş vermək; *I instructed him to come to work earlier Mən ona göstəriş verdim ki, işə daha tez gəlsin*

**instruction** [ɪnˈstrʌkʃn] *n* **1.** öyrətmə, təhsil vermə; **to give ~ in English / in music / in swimming** ingilis dilini / musiqini / üzməyi öyrətmək; **2.** təlimat, təlimat vermə; sərəncam / göstəriş vermə

**instructive** [ɪnˈstrʌktɪv] *adj* ibrətli, ibrətamiz, ibrətverici; faydalı; ~ **conversation / talk** ibrətamiz söhbət

**instructor** [ɪnˈstrʌktəʳ] *n* **1.** müəllim; **2.** təlimatçı; rəhbər (*dərnəyə və s.*)

**instrument** [ˈɪnstrumənt] *n* **1.** alət, cihaz; **surgical ~s** cərrah alətləri; **2.** vasitə; **~ of aggression** təcavüz vasitəsi; **3.** musiqi aləti; **stringed / wind ~s** simli / nəfəsli musiqi alətləri

**instrumental** [ˌɪnstruˈmentl] *adj* **1.** alət kimi istifadə edilən; faydalı, mənfəətli, müəyyənedici; **to be ~ in bringing about *smth.*** bir məqsədə çatmaq üçün faydalı olmaq; **2.** *mus.* instrumental; ~ **music** instrumental musiqi; **3.** *qram.*: ~ **case** birgəlik halı

**instrumentalist** [ˌɪnstruˈmentəlɪst] *n* instrumentalist, çalğıçı (*bir musiqi alətində çalan adam*)

**insubordinate** [ˌɪnsəˈbɔ:dənɪt] *adj* itaət etməyən, tabe olmayan, boyun əyməyən

**insubstantial** [ˌɪnsəbˈstænʃl] *adj* əhəmiyyətsiz, əhəmiyyəti az olan; qeyri-real, real olmayan; zahiri, xəyali

**insufferable** [ɪnˈsʌfərəbl] *adj* dözülməz, qatlaşılmaz; **an ~ person** dözülməz adam

**insufficient** [ˌɪnsəˈfɪʃnt] *adj* az, kifayət etməyən, qeyri-kafi; ~ **time** az / kifayət etməyən vaxt

**insular** [ˈɪnsjuləʳ] *adj* **1.** ada; ~ **fortress** adada yerləşən qala

**insulate** [ˈɪnsjuleɪt] *v* ayırmaq, təcrid etmək; izolyasiya etmək

**insulation** [ˌɪnsjuˈleɪʃn] *n* təcrid etmə, ayırma; *el.* izolə etmə; izolə etmək üçün material

**insult**[1] [ˈɪnsʌlt] *n* təhqir, təhqir etmə, həqarət; **to bear an ~** təhqirə dözmək; **to swallow an ~** təhqiri udmaq;

**insult**[2] [ˈɪnsʌlt] *v* təhqir etmək, alçaltmaq; **to ~ *smb.*** bir kəsi təhqir etmək

**insulting** [ɪnˈsʌltɪŋ] *adj* təhqiredici, həqarətli, alçaldıcı, toxunan

**insuperable** [ɪnˈsju:pərəbl] *adj* dəfedilməz, güccatmayan, aradan qaldırıla bilməyən; ~ **difficulties** güccatmayan çətinliklər

**insupportable** [ˌɪnsəˈpɔ:təbl] *adj* dözülməz, qatlaşılmaz, şiddətli, bərk

**insurance**[1] [ɪnˈʃuərəns] *n* **1.** sığorta, sığorta etmə / etdirmə / edilmə; **social** ~ ictimai sığorta; **2.** sığortanın məbləği

**insurance**[2] [ɪnˈʃuərəns] *adj* sığorta; ~ **company** sığorta cəmiyyəti

**insure** [ɪnˈʃuəʳ] *v* **1.** sığorta etmək / etdirmək; **to ~ *one's* life** öz həyatını sığorta etdirmək; **2.** sığorta olunmaq; **to ~ at a low premium** çox az məbləğdə sığorta olunmaq; **3.** təmin etmək, qarantiya vermək; **to ~ success** nailiyyəti təmin etmək

**insurgent** [ɪnˈsə:dʒənt] *n* üsyançı, qiyamçı

**insurmountable** [ˌɪnsə:ˈmauntəbl] *adj* aradan qaldırıla bilməyən, kənar edilə bilməyən

**insurrection** [ˌɪnsəˈrekʃn] *n* üsyan; qiyam; **an armed ~** silahlı üsyan

**intact** [ɪnˈtækt] *adj* ziyan dəyməmiş, toxunulmamış, bütöv; **to be left ~** toxunulmamış qalmaq

**intake** [ˈɪnteɪk] *n* qəbul, qəbul etmə (*işə, məktəbə*); **the yearly ~ of students** illik tələbə qəbulu





**intangible** [ɪnˈtændʒəbl] *adj* duyulmayan, hissedilməz, hiss olunmayan; əhəmiyyətsiz

**integral** [ˈɪntɪgrəl] *adj* **1.** ayrılmaz, əsas; **an ~ part of *smth.*** bir şeyin ayrılmaz hissəsi; **2.** *riyaz.* inteqral; ~ **calculus** inteqral hesablama

**integrate** [ˈɪntɪgreɪt] *v* **1.** vahid halda birləşdirmək; **to ~ private schools into state education system** xüsusi məktəbləri dövlət təhsil sisteminə vahid halda birləşdirmək; **2.** *riyaz.* inteqrallamaq

**integrity** [ɪnˈtegrɪtɪ] *n* **1.** düzlük, təmizlik, səmimiyyət; **a man of ~** səmimi adam; **2.** təmizlik, bütövlük, toxunulmazlıq; **to guarantee the territorial ~ of a country** ölkənin ərazi bütövlüyünə təminat vermək

**intellect** [ˈɪntəlekt] *n* ağıl, zəka, idrak

**intellectual** [ˌɪntɪˈlektjuəl] *adj* **1.** əqli, zehni; fikri; ~ **faculties** əqli / zehni qabiliyyətlər; **2.** ağıllı, zəkalı, zehinli; ~ **person** ağıllı / zəkalı adam

**intelligence** [ɪnˈtelɪdʒəns] *n* **1.** ağıl; zəka, zehin, şüur; **a person of high / average / low ~** yüksək / orta / aşağı əqli qabiliyyətə malik adam; **2.** məlumat, informasiya

**intelligent** [ɪnˈtelɪdʒənt] *adj* ağıllı, zəkalı, fərasətli, dərrakəli; **an ~ child** ağıllı / fərasətli / dərrakəli uşaq; ~ **question / reply** ağıllı sual / cavab

**intelligible** [ɪnˈtelɪdʒəbl] *adj* aydın, anlaşıqlı, anlaşılan; **an ~ description / explanation** aydın təsvir / izahat

**intemperate** [ɪnˈtempərət] *adj* nəfsini / özünü saxlamayan, pəhriz gözləməyən; həddindən artıq istifadə edən (*xüs. spirtli içkilərdən*)

**intend** [ɪnˈtend] *v* **1.** niyyət etmək, …niyyətində / …fikrində olmaq, istəmək; *I intend to go Mən getmək fikrindəyəm; I intend them to go Mən istəyirəm ki, onlar getsin;* **2.** irəlicədən müəyyən etmək, nəzərdə tutmaq; *This book is intended for children Bu kitab uşaqlar üçün nəzərdə tutulub*

**intended** [ɪnˈtendɪd] *adj* nəzərdə tutulmuş; **a book ~ for children** uşaqlar üçün nəzərdə tutulmuş kitab

**intense** [ɪnˈtens] *adj* **1.** bərk, şiddətli, kəskin; ~ **cold** bərk / şiddətli soyuq; ~ **heat** bərk / şiddətli isti; **2.** qatı, tünd; ~ **colour** tünd boya; **3.** gərgin, qızğın; intensiv; ~ **studies** intensiv / gərgin məşğələlər

**intensely** [ɪnˈtenslɪ] *adv* çox qızğın, bərk, kəskin, hərarətlə; **to love** ~ hərarətlə sevmək; **an ~ cold night** həddən artıq soyuq gecə

**intensify** [ɪnˈtensɪfaɪ] *v* **1.** gücləndirmək, artırmaq; **to ~ the heat** istiliyi artırmaq; **to ~ *one's* attention** diqqətini artırmaq / gərginləşdirmək; **2.** artmaq, güclənmək; *The wind intensifies Külək güclənir*

**intensive** [ɪnˈtensɪv] *adj* **1.** intensiv, gərgin; ~ **development** intensiv inkişaf; **2.** *qram.* gücləndirici; ~ **particle** gücləndirici ədat

**intent**[1] [ɪnˈtent] *n* niyyət, məram, məqsəd, arzu, murad, fikir; **with good ~** xoş niyyətlə / məramla / məqsədlə; **with evil ~** pis niyyətlə

**intent**[2] [ɪnˈtent] *adj* **1.** bir yerə toplanmış; dikilmiş, zillənmiş (*göz, baxış haq.*); ~ **look** gərgin / zillənmiş baxış; **to be ~ on *smth.*** diqqətini bir şeyə cəmləşdirmək; **2.** **(on)** məşğul / başıqarışıq olan (*bir şeylə*); **to be ~ on writing** yazmaqla məşğul olmaq; **3.** cəhd edən, çalışan; **to be ~ on *one's* purpose** məqsədinə can atmaq

**intention** [ɪnˈtenʃn] *n* niyyət, məram, məqsəd, arzu, fikir; səy, cəhd; **to have the ~ of doing *smth.*** bir şeyi etmək niyyəti olmaq

**intentional** [ɪnˈtenʃənl] *adj* qəsdən / qərəzlə edilən, qabaqcadan düşünülmüş; ~ **act** qəsdən / bilə-bilə edilən hərəkət

**intently** [ɪnˈtentlɪ] *adv* diqqətlə, səliqə ilə, əsaslı surətdə / tərzdə

**interact** [ˌɪntərˈækt] *v* qarşılıqlı təsir etmək, bir-birinə təsir göstərmək

**interaction** [ˌɪntərˈækʃn] *n* qarşılıqlı təsir / əlaqə, bir-birinə təsir etmə; **the ~ of systems** sistemlərin bir-birinə qarşılıqlı təsiri

**intercede** [ˌɪntəˈsɪ:d] *v* müdafiə / himayə etmək, tərəfdar olmaq (*bir kəsə*), xahiş etmək; **to ~ for mercy** bağışlanmaq üçün xahiş etmək

**intercept** [ˌɪntəˈsept] *v* **1.** tutmaq, ələ keçirmək, zəbt etmək; **to ~ a ship / a plane** gəmi / təyyarə ələ keçirmək / tutmaq; **2.** kəsmək (*cərəyanı, suyu və s.*); **to ~ the flow of water** suyun verilməsini kəsmək

**intercession** [ˌɪntəˈseʃn] *n* **1.** xahiş; havadarlıq, müdafiə / himayə etmə; vasitəçilik; **to make an ~ for *smb.*** bir kəsin əvəzinə xahiş etmə

**interchange** [ˌɪntəˈtʃeɪndʒ] *v* **1.** əvəz etmək, əvəzləmək, yerini dəyişmək, dəyişdirmək; **to ~ the front and rear tyres of a car** maşının qabaq və dal təkərlərinin yerini dəyişmək; **2.** mübadilə etmək; bir-birinə göndərmək; **to ~ information** bir-birinə məlumat göndərmək; **3.** növbələşmək, bir-birini əvəz etmək; *Rain interchanged snow Yağış qarı əvəz etdi*

**interchangeable** [ˌɪntəˈtʃeɪndʒəbl] *adj* bir-birini əvəz edən / edə bilən; *The two words are virtually interchangeable Bu iki söz əslində bir-birini əvəz edir*

**intercom** [ˈɪntəkɔm] *n* (**intercommunication** *sözünün qısa forması*) daxili telefon əlaqəsi

**intercommunicate** [ˌɪntəkəˈmjuːnɪkeɪt] *v* **1.** bir-birilə əlaqəsi olmaq (*otaq və s. haq.*); **rooms which ~** biri-birinə bitişik / iç-içə otaqlar

**interconnect** [ˌɪntəkəˈnekt] *v* birləşdirmək; qarşılıqlı əlaqədə olmaq; *I see these two ideas are somehow interconnected Məncə bu iki fikir bu və ya digər mənada əlaqədədir*

**intercontinental** [ˌɪntəkɔntɪˈnentl] *adj* qitələrarası; **~ ballistic missile** qitələrarası ballistik raket

**intercouse** [ˈɪntəkɔːs] *n* ünsiyyət, əlaqə, dostcasına münasibət; **personal ~** şəxsi əlaqə; **diplomatic ~** diplomatik əlaqə; **commercial / trade ~** ticarət əlaqəsi; **sexual ~** cinsi əlaqə

**interdependent** [ˌɪntədɪˈpendənt] *adj* bir-birindən asılı olan; **~ nations** bir-birindən asılı ölkələr

**interdict** [ˈɪntədɪkt] *v* qadağan / yasaq etmək, qadağa / yasaq qoymaq

**interest**[1] [ˈɪntrɪst] *n* **1.** maraq; **to have (an) ~ in *smth.*** bir şeydə marağı olmaq; **to show (an) ~ in *smth.*** bir şeyə maraq göstərmək; **to lose ~ in *smth.*** bir şeyə marağı itirmək; **mutual / common ~s** qarşılıqlı / ümumi maraqlar; **2** *pl* mənafe, mənfəət, xeyir; qazanc; **public ~s** ictimai mənafe; **private ~s** şəxsi mənafelər; **3.** pay; **to have an ~ in a business** bir biznesdə payı olmaq; **4.** faiz, faizlə gəlir; **to live on the ~ received from *one's* capital** öz kapitalından aldığı gəlirlə yaşamaq

**interest**[2] [ˈɪntrɪst] *v* maraqlandırmaq, maraq doğurmaq; maraqlanmaq; *The article interests everybody Məqalə hamını maraqlandırır*; **to ~ *smb.* in a problem** bir kəsdə problemə maraq doğurmaq; **to ~ oneself in *smth.*** bir şeylə maraqlanmaq

**interested** [ˈɪntrɪstɪd] *adj* maraqlanan, maraq göstərən; diqqətli; **~ listener** diqqətli dinləyici; **~ spectators** maraq göstərən tamaşaçılar

**interesting** [ˈɪntrɪstɪŋ] *adj* maraqlı, maraq doğuran, marağa səbəb olan; **~ news** maraqlı / maraq doğuran xəbər; **~ anecdote** maraqlı lətifə

**interfere** [ˌɪntəˈfɪəʳ] *v* **1.** qarışmaq; müdaxilə etmək; **to ~ in / with *smb.'s* affairs** bir kəsin işlərinə qarışmaq / müdaxilə etmək; **2.** mane olmaq, maneçilik törətmək; *Don't interfere with me / with my work Mənə / Mənim işimə mane olma / olmayın*

**interference** [ˌɪntəˈfɪərəns] *n* qarışma, müdaxilə, müdaxilə etmə; **~ in the business of others** başqalarının işinə qarışma / müdaxilə etmə

**interfering** [ˌɪntəˈfɪərɪŋ] *adj* mane olan, maneçilik törədən; zəhlətökən, təngəgətirən, bezikdirən, usandıran

**interim** [ˈɪntərɪm] *adj* müvəqqəti; ilk, ilkin; aralıq; **~ government** müvəqqəti hökumət; **~ report** ilkin məlumat; **~ commission** müvəqqəti komissiya; **~ order** müvəqqəti sərəncam; **to hold an ~ appointment** müvəqqəti olaraq vəzifə tutmaq

**interior**[1] [ɪnˈtɪərɪəʳ] *n* **1.** iç, bir şeyin daxili; binanın içərisi, içəri tərəf; **the ~ of a room** otağın içi / içəri tərəfi / daxili; **2.** daxili işlər (*dövlətin*); **Department of the Interior** Daxili İşlər Nazirliyi (*ABŞ-da və Kanadada*)

**interior**[2] [ɪnˈtɪərɪəʳ] *adj* daxili, iç; **~ repairs** daxili təmir; **the ~ walls of a building** binanın daxili divarları

**interjection** [ˌɪntəˈdʒekʃn] *n qram.* nida

**interlace** [ˌɪntəˈleɪs] *v* hörmək, toxumaq; birləşdirmək; **to ~ *smb.'s* hair with ribbons** bir kəsin saçını lentlə hörmək





**intermarriage** [ˌɪntəˈmærɪdʒ] *n* **1.** müxtəlif millət və ya irqə mənsub olan adamların evlənməsi; **2.** *d.d.* qohumlar arasında nikah

**intermediary** [ˌɪntəˈmiːdjərɪ] *n* **1.** vasitəçi, araçı; dəllal; aradüzəldən; **to act as ~ for *smb.*** bir kəsin vasitəçisi olmaq; **2.** vasitəçilik

**intermediate** [ˌɪntəˈmiːdjət] *n* aradüzəldən, vasitəçi (*adam haq.*)

**intermediate**[2] [ˌɪntəˈmiːdjət] *adj* aralıq; **~ level** aralıq səviyyə; **~ stage** aralıq mərhələ

**interminable** [ˌɪntəˈmɪnəbl] *adj* nəhayətsiz, sonsuz, hədsiz; **~ discourse** sonsuz / nəhayətsiz söhbət; **~ forests** ucsuz-bucaqsız meşələr

**intermingle** [ˌɪntəˈmɪŋgl] *v* qarışdırmaq, qatışdırmaq; qarışmaq; **to ~ colours** rəngləri / boyaları qarışdırmaq

**intermittent** [ˌɪntəˈmɪtənt] *adj* kəsilən, qırılan; qırıq-qırıq, kəsik-kəsik (*səs haq.*), qeyri-müntəzəm işləyən, dayanan (*bir müddət*); **~ laughter** qırıq-qırıq gülüş; **~ current** *el.* qeyri-müntəzəm cərəyan; **~ fever** qalxıb-düşən qızdırma

**intern**[1] [ɪnˈtəːn] *n amer. tibb kollecinin tələbəsi və ya xəstəxanada işləyən və orada yaşayan gənc həkim*

**intern**[2] [ɪnˈtəːn] *v* tərk-silah edib ölkə daxilində saxlamaq; **to ~ a warship / enemy citizens in time of war** müharibə zamanı / vaxtı hərbi gəmini / düşmən vətəndaşlarını tərk-silah edib ölkə daxilində saxlamaq

**internal** [ɪnˈtəːnl] *adj* daxili, iç; **~ doors** daxili / iç qapılar; **~ parts of a body** bədənin daxili orqanları; **~ bleeding** daxili qanaxma

**international** [ɪntəˈnæʃnl] *adj* beynəlxalq; **~ law / agreement / trade / conference** beynəlxalq qanun / müqavilə / ticarət / konfrans; **~ peace** bütün dünyada sülh

**internationality** [ˈɪntəˌnæʃˈnælɪtɪ] *n* beynəlmiləlçilik, beynəlmiləlçi xarakter / xüsusiyyət

**internecine** [ˌɪntəˈniːsaɪn] *adj*: **1. ~ war** daxili müharibə; **2.** ölümsaçan, öldürücü, məhvedici; qanlı; **~ massacre** qanlı qırğın

**interplanetary** [ˌɪntəˈplænɪtrɪ] *adj* planetlərarası, planetlər arasında olan; **~ space** planetlərarası fəza

**interplay** [ˈɪntəpleɪ] *n* qarşılıqlı təsir, bir-birinə təsir; qarşılıqlı əlaqə / rabitə; **the ~ of plot and character** süjet və obraz arasında qarşılıqlı əlaqə

**interpret** [ɪnˈtəːprɪt] *v* **1.** şərh etmək, məna vermək; aydınlaşdırmaq; **to ~ a difficult text** çətin mətni şərh etmək; **2.** yozmaq (*yuxunu*); **to ~ a dream** yuxu yozmaq; **3.** anlamaq, başa düşmək; **4.** dilmanclıq / tərcümə etmək (*şifahi*); **to ~ for *smb.*** bir kəsə dilmanclıq etmək

**interpretation** [ɪnˌtəːprɪˈteɪʃn] *n* **1.** izah, şərh; başa salma; yozma; **to give different ~s of the same facts** eyni faktlara müxtəlif izahatlar / şərhlər vermək; **2.** tərcümə (*şifahi*), dilmanclıq

**interpreter** [ɪnˈtəːprɪtəʳ] *n* dilmanc, tərcüməçi (*şifahi olaraq*); **to carry on negotiations through an ~** danışıqları dilmanc vasitəsilə aparmaq

**interrelate** [ˌɪntərɪˈleɪt] *v* (*adət. məchulda işlədilir*) sıx surətdə əlaqədə / əlaqədar olmaq

**interrelated** [ˌɪntərɪˈleɪtɪd] *adj* bir-birinə təsir edən, qarşılıqlı əlaqədə olan

**interrelation** [ˌɪntərɪˈleɪʃn] *n* (**of, between**) qarşılıqlı əlaqə / münasibət

**interrogate** [ɪnˈterəgeɪt] *v* **1.** soruşmaq, xəbər almaq; **2.** sual / sorğu-sual etmək; dindirmək, istintaq etmək; **to ~ a witness** şahidi dindirmək

**interrogation** [ɪnˌterəˈgeɪʃn] *n* dindirmə, istintaq; sorğu-sual

**interrogative** [ˌɪntəˈrɔgətɪv] *adj* sual, sualedici, sualverici; **an ~ sentence** sual cümləsi; **~ pronouns** sual əvəzlikləri; **~ look** sualedici / şübhəli baxış

**interrogator** [ɪnˈterəgeɪtəʳ] *n* müstəntiq, silistçi; sorğu-sual aparan adam

**interrupt** [ˌɪntəˈrʌpt] *v* **1.** kəsmək, dayandırmaq; qırmaq; sözünü kəsmək; **to ~ a lecture with a question** mühazirəni sual verməklə kəsmək; **2.** mane olmaq, pozmaq; **to ~ *smb.'s* sleep** bir kəsin yuxusunu pozmaq

**interruption** [ˌɪntəˈrʌpʃn] *n* **1.** fasilə, tənəffüs, dayandırma, saxlama; **to work with ~s** fasilələrlə işləmək; **to speak without ~** fasiləsiz / dayanmadan danışmaq;

2. kəsmə, pozma; maneə; ~ **of telephone communication** telefon əlaqəsinin kəsilməsi; **to meet with many ~s** çoxlu maneələrlə qarşılaşmaq / rastlaşmaq

**intersect** [ˌɪntə'sekt] *v* **1.** kəsmək; kəsib keçmək, iki bölmək; *The path intersects the field Cığır / Yol tarlanı iki bölür;* **2.** kəsişmək

**intersperse** [ˌɪntə'spə:s] *v* səpələmək; səpmək; **red tulips ~d among the yellow** sarı qərənfillər arasında səpələnmiş qırmızı qərənfillər

**interstate** [ˌɪntə'steɪt] *adj amer.* ştatlararası; **~ commerce / highways** ştatlararası ticarət / şosse yolları

**interval** ['ɪntəvl] *n* **1.** ara, aralıq; məsafə; interval; ~ **between two trees** iki ağac arasında məsafə; **at short / long ~s** uzun / qısa fasilələrlə; **a minute's ~** bir dəqiqəlik fasilə; **2.** tənəffüs; **an ~ between two lessons** iki dərs arasında tənəffüs; **in the ~** tənəffüs vaxtı / zamanı; **3.** antrakt

**intervene** [ˌɪntə'vi:n] *v* **1.** olmaq, baş vermək, vaqe olmaq; **2.** qarışmaq, müdaxilə etmək; **to ~ in a dispute** mübahisəyə müdaxilə etmək; **3.** mane olmaq, maneçilik törətmək; *I'll come if nothing intervenes Əgər bir şey mane olmasa, gələcəm*

**intervention** [ˌɪntə'venʃn] *n* qarışma, müdaxilə, müdaxilə etmə; vasitəçilik; **surgical ~** cərrahiyyə müdaxiləsi; **military ~** hərbi müdaxilə

**interview[1]** ['ɪntəvju:] *n* intervyu, müsahibə; **to have an ~ with** *smb.* bir kəsdən müsahibə almaq

**interview[2]** ['ɪntəvju:] *v* intervyu / müsahibə almaq, söhbət etmək / aparmaq

**intestate** ['ɪntestɪt] *adj hüq.* vəsiyyət etmədən ölən

**intestine** [ɪn'testɪn] *n anat.* (*adət. pl*) bağırsaq; **small / large ~** nazik / yoğun bağırsaq

**intimacy** ['ɪntɪməsɪ] *n* yaxın əlaqə, yaxınlıq, məhrəmlik, dostluq; **to be one of** *smb.'s* **~** bir kəsin yaxın dostu olmaq

**intimate[1]** ['ɪntɪmɪt] *adj* **1.** yaxın, səmimi; **~ friends** yaxın / səmimi dostlar; **2.** məhəbbət, aşiqanə; **~ connection** məhəbbət / aşiqanə əlaqə; **~ letters** məhəbbət / sevgi məktubları

**intimate[2]** ['ɪntɪmeɪt] *v amer.* rəsmi olaraq elan etmək, xəbər vermək, bildirmək; **to ~** *smth.* **to** *smb.* bir kəsə bir şey haqqında xəbər vermək; **to ~ open war against** *smb.* bir kəsə açıq müharibə elan etmək

**intimation** [ˌɪntɪ'meɪʃn] *n* elan etmə, bildirmə, təklif, təklif etmə

**intimidate** [ɪn'tɪmɪdeɪt] *v* qorxutmaq, hədələmək; hədə-qorxu gəlmək

**intimidation** [ɪnˌtɪmɪ'deɪʃn] *n* qorxutma, hədə, qorxu

**into** *qüvvətli forması:* [ɪntu:]; *saitlərdən əvvəl:* ['ɪntə] *prep* **1.** *Azərbaycan dilində bir qayda olaraq* **-a, -ə, -ya, -yə** + *yönlük hal şəkilçiləri və yaxud iç* + *yönlük hal şəkilçisinə uyğun gəlir: Let's go into the garden Gəl / Gəlin bağa gedək; The river flows into the lake Çay gölə tökülür; Put the pencils into the box Karandaşları qutuya / qutunun* ***içinə*** *qoy / qoyun;* **to get ~ trouble** bəlaya düşmək / düçar olmaq; **to get ~ difficulties** çətinliyə düşmək

**intolerable** [ɪn'tɔlərəbl] *adj* dözülməz, çox ağır / pis; **~ heat / cold / pain** dözülməz isti / soyuq

**intolerant** [ɪn'tɔlərənt] *adj* dözülməz, dözülməyən; **an ~ nature** dözülməz xarakter (*xasiyyət*)

**intoxicate** [ɪn'tɔksɪkeɪt] *v* keflənmək, sərxoş / məst olmaq; **to be ~d with / by success** müvəffəqiyyətdən məst olmaq

**intoxication** [ɪnˌtɔksɪ'keɪʃn] *n* **1.** keflənmə, sərxoş / kefli / məst olma; **2.** *tib.* zəhərlənmə

**intractable** [ɪn'træktəbl] *adj* **1.** tərs, inadkar, höcət; yolagetməz; **~ child** tərs uşaq; **2.** çətin, həllolunmaz; **~ problem** çətin problem

**intransigent** [ɪn'trænsɪdʒənt] *adj* barışmaz; dayanıqlı, fikrindən dönməyən, barışmayan; **~ attitude** barışmaz münasibət

**intransitive** [ɪn'trænsətɪv] *adj qram.* təsirsiz; **~ verbs** təsirsiz fellər

**intrepid** [ɪn'trepɪd] *adj* cürətli, cəsur, qorxu bilməyən, cəsarətli; **an ~ soldier** cəsur əsgər

**intricacy** ['ɪntrɪkəsɪ] *n* dolaşıqlıq, qarışıqlıq, mürəkkəblik, çəlpəşiklik

**intricate** ['ɪntrɪkɪt] *adj* dolaşıq, qarışıq, mürəkkəb, müəmmalı, çəlpəşik; **~ system** mürəkkəb sistem; **an ~ problem** mürəkkəb problem

**intrigue[1]** [ɪn'tri:g] *n* **1.** intriqa, fitnə, fəsad; hiylə; **political ~s** siyasi intriqalar; **2.** məhəbbət əlaqəsi, eşqbazlıq

**intrigue[2]** [ɪn'tri:g] *v* **1.** intriqa salmaq / aparmaq; **to ~ against** *smb.* bir kəsə qarşı intriqa aparmaq; **2.** maraqlandırmaq, maraq oyatmaq / yaratmaq; *The children were intrigued by / with the new toy Uşaqlar təzə oyuncaqla maraqlandılar*

**intriguing** [ɪn'tri:gɪŋ] *adj* **1.** maraqlandırıcı, maraq doğuran; **an ~ piece of news** maraq doğuran xəbər; **2.** maraqlı, əyləncəli

**intrinsic** [ɪn'trɪnsɪk] *adj* **1.** əsl, həqiqi; doğru; **a person's ~ worth** adamın əsl / həqiqi mahiyyəti; **2.** xas olan; **beauty ~ to** *smb.* / *smth.* bir kəsə / şeyə xas olan gözəllik

**introduce** [ˌɪntrə'dju:s] *v* **1.** daxil etmək, gətirmək; **2.** müzakirəyə çıxartmaq; **to ~ a question for debate** məsələni müzakirəyə çıxartmaq / qoymaq; **3.** təqdim / tanış etmək; **to ~ one person to another** bir şəxsi digər bir kəslə tanış etmək

**introduction** [ˌɪntrə'dʌkʃn] *n* **1.** təqdim etmə (*rəsmi*), tanışlıq; **2.** müqəddimə, giriş; giriş sözü; ~ qısa / ümumi giriş; **an ~ to Astronomy / Linguistics / Chemistry,** *etc.* astronomiyaya / dilçiliyə / kimyaya giriş

**introductory** [ˌɪntrə'dʌktərɪ] *adj* giriş; **~ chapter** giriş fəsli; **~ course** giriş kursu

**introvert** ['ɪntrəvə:t] *n* öz aləminə qapılmış adam, öz maraqları haqqında düşünən

**intrude** [ɪn'tru:d] *v* **1.** qarışmaq, müdaxilə etmək; *I'm sorry to intrude, Müdaxilə etdiyim üçün üzr istəyirəm;* **2.** mane olmaq; *I hope I am not intruding Ümid edirəm ki, sənə / sizə mane olmuram;* **3.** zorla qəbul etdirmək / boynuna qoymaq; **to ~** ***one's*** **views / *one's* opinions upon** *smb.* öz fikirlərini / baxışlarını bir kəsə zorla qəbul etdirmək; **4.** zəhlə tökmək, əl çəkməmək

**intruder** [ɪn'tru:də[r]] *n* zəhlə tökən / aparan adam, sırtıq adam; çağrılmamış qonaq

**intrusion** [ɪn'tru:ʒn] *n* müdaxilə, müdaxilə etmə, qarışma; zorla girmə; dəvətsiz gəlmə; **unpardonable ~** bağışlanılmaz müdaxilə

**intuition** [ˌɪntju'ɪʃn] *n* intuisiya, duyğu, duyma, sezmə

**intuitive** [ɪn'tju:ɪtɪv] *adj* intuitiv; intuisiyaya əsaslanan; **~ knowledge** intuitiv / intuisiyaya əsaslanan bilik

**inundate** ['ɪnʌndeɪt] *v* **1.** basmaq, daşıb basmaq; *The river burst its banks and inundated nearby villages Çay sahillərini aşaraq yaxın kəndləri basdı;* **2.** *məc.* doldurmaq; tökmək, töküb doldurmaq; **to be ~d with letters / invitations** üstünə məktublar / dəvətlər yağdırılmaq

**invade** [ɪn'veɪd] *v* **1.** zəbt / istila / işğal / qəsb etmək, tutmaq; **to ~ a country** ölkəni işğal etmək; **2.** hücum çəkmək, doldurmaq, axışıb gəlmək, tökülüşmək (*camaat və s. haq.*); *Tourists invaded the city Turistlər şəhərə axışıb tökülüşdülər*

**invader** [ɪn'veɪdə[r]] *n* işğalçı, istilaçı, qəsbkar

**invalid[1]** ['ɪnvælɪd] *n* əlil, şikəst, çolaq, şil; **a resort of / for ~s** əlillər / xəstələr üçün kurort;

**invalid[2]** ['ɪnvælɪd] *adj* **1.** əlil, şikəst, çolaq, şil; **~ home** əlillər evi / üçün ev; **an ~ chair** əlil arabası; **2.** rəsmi olaraq qəbul edilməyən, saxta; **an ~ passport** saxta pasport

**invalidate** [ɪn'vælɪdeɪt] *v hüq.* qanuni gücündən salmaq; qüvvəsini itirmiş hesab etmək (*sənəd və s. haq.*); **to ~ an agreement** sazişi etibarsız hesab etmək

**invalidity** [ˌɪnvə'lɪdɪtɪ] *adj* şikəstlik, əlillik; **an ~ pension** əlillik təqaüdü

**invaluable** [ɪn'væljuəbl] *adj* qiymətə gəlməz, son dərəcə qiymətli, misli-bərabəri olmayan; **~ help / advice / information** son dərəcə qiymətli kömək / məsləhət / xəbər

**invariable** [ɪn'veərɪəbl] *adj* sabit, dəyişməz, dəyişməyən; **~ temperature** sabit temperatur

**invariably** [ɪn'veərɪəblɪ] *adv* həmişə, daim, adətən, hər vaxt / dəfə; *She invariably comes late O, həmişə gec gəlir*

**invasion** [ɪn'veɪʒn] *n* hücum, soxulma, basqın; **2.** axın; **an ~ of tourists** turistlərin axını; **3.** qarışma, müdaxilə etmə

**invective** [ɪn'vektɪv] *n* **1.** təhqir, təhqiredici nitq; **speech filled with ~s** təhqirlə dolu nitq; **2.** söyüş, söymə; **to fling / to hurl ~ at** *smb.* bir kəsin üstünə söyüş yağdırmaq

**inveigh** [ɪn'veɪ] *v* (**against**) söymək, abrını tökmək, söyüb biabır etmək; **to ~ against *smb.*** bir kəsin abrını tökmək
**inveigle** [ɪn'vi:gl] *v* tovlamaq, yoldan / başdan çıxartmaq, şirnikdirmək
**invent** [ɪn'vent] *v* **1.** kəşf / ixtira etmək, **to ~ a machine / a radio** maşın / radio ixtira / kəşf etmək; **2.** uydurmaq, özündən qondarmaq, quraşdırmaq; **to ~ an explanation** səbəb / bəhanə uydurmaq
**invention** [ɪn'venʃn] *n* **1.** kəşf, ixtira; **the ~ of the telescope / of radio** teleskopun / radionun kəşfi; **2.** uydurma, qondarma, quraşdırma; *His story is a pure invention Onun danışdıqları tamam uydurmadır*
**inventive** [ɪn'ventɪv] *adj* fərasətli, zirək, hazırcavab, diribaş; **an ~ child** zirək uşaq
**inventor** [ɪn'ventə$^r$] *n* ixtiraçı, ixtira / kəşf edən
**inventory** ['ɪnvəntrɪ] *n* inventarizasiya; inventarizasiya siyahısı; **to take / to make up an ~** inventarizasiya aparmaq
**inventory**[2] ['ɪnvəntrɪ] *v* siyahıya almaq, inventar siyahısına salmaq; **to ~ the goods once a year** ildə bir dəfə malları yenidən uçota almaq / yoxlamaq
**inverse** ['ɪn'və:s] *adj* əks, zidd; geri; *Division is the inverse operation of multiplication Bölmə əməliyyatı vurmanın əksidir*
**invert** ['ɪnvə:t] *v* **1.** çevirmək, döndərmək, baş-ayaq qoymaq; **to ~ a glass / a jar / a tumbler** stəkanı / parçı / qədəhi baş-ayaq çevirmək; **2.** astar üzünə çevirmək; **3.** sırasını dəyişmək; **to ~ the order of words in a sentence** cümlədə sözlərin sırasını dəyişmək
**inverted** [ɪn'və:tɪd] *adj* **1.** çevrilmiş, dönmüş, baş-ayaq qoyulmuş / çevrilmiş; **~ boat** çevrilmiş / dönmüş qayıq; **~ commas** dırnaq; **2.** əks, inversiya edilmiş; **~ order of words** sözlərin inversiyası / yer dəyişməsi; **3.** astar üzünə çevrilmiş
**invest** [ɪn'vest] *v* **1.** pul / sərmayə / kapital qoymaq; **to ~ *one's* money in a business enterprise** pulunu ticarət müəssisəsinə qoymaq; **2.** geyindirmək, bəzəndirmək; **to ~ *smb.* with a gown** bir kəsə don geyindirmək; **3.** səlahiyyət / rütbə / hakimiyyət vermək
**investigate** [ɪn'vestɪgeɪt] *v* **1.** təhqiq etmək, araşdırmaq, yoxlamaq; **to ~ a crime** cinayəti araşdırmaq / təhqiq etmək; **2.** öyrənmək; müəyyən etmək; **to ~ nature** təbiəti öyrənmək
**investigation** [ɪn,vestɪ'geɪʃn] *n* **1.** istintaq; təhqiqat; **to carry on an ~** istintaq aparmaq; **2.** tədqiqat (*elmi*); **to carry on ~** tədqiqat işi aparmaq
**investigator** [ɪn'vestɪgeɪtə$^r$] *n* tədqiqatçı
**investment** [ɪn'vestmənt] *n* **1.** kapital / sərmayə qoyuluşu; kapital / sərmayə qoyma; **a company's ~ plans** şirkətin kapital qoyma planları; **2.** sərmayə / kapital qoyulan müəssisə və ya qiymətli kağız; investisiya
**investor** [ɪn'vestə$^r$] *n* investor, əmanətçi
**inveterate** [ɪn'vetərət] *adj* **1.** islahedilməz, düzəldilməz, qatı; **~ liar** islahedilməz yalançı; **2.** köksalmış, kökbağlamış, köhnə; **~ hostility** köhnə düşmənçilik
**invidious** [ɪn'vɪdɪəs] *adj* təhqiredici, ikrah doğuran; nifrətoyadan; **~ remark** təhqiredici irad
**invigilate** [ɪn'vɪdʒɪleɪt] *v* ciddi surətdə nəzarət etmək (*xüs imtahanda*); **to ~ (at) the history exam** tarix imtahanına ciddi surətdə nəzarət etmək
**invigorate** [ɪn'vɪgəreɪt] *v* ruhlandırmaq, ruh vermək; ilhamlandırmaq; *His speech invigorated the audience Onun nitqi dinləyiciləri ruhlandırdı*
**invincible** [ɪn'vɪnsəbl] *adj* məğlubedilməz, yenilməz, basılmaz; **an ~ army** məğlubedilməz / yenilməz ordu
**inviolable** [ɪn'vaɪələbl] *adj* sarsılmaz, yenilməz, möhkəm, pozulmaz, toxunulmaz; **~ rights** toxunulmaz hüquqlar; **~ laws** möhkəm qanunlar
**invisible** [ɪn'vɪzəbl] *adj* **1.** görünməyən, gözəgörünməz; seçilməyən; **~ particles** gözəgörünməyən hissəciklər; **~ man** gözəgörünməyən adam; **2.** gizli, xəlvəti; **~ earnings** gizli / xəlvəti qazanclar
**invitation** [,ɪnvɪ'teɪʃn] *n* dəvət; dəvət etmə / edilmə; dəvətnamə; **an ~ to dinner** nahara dəvət etmə; **to come by *smb.'s* ~** bir kəsin dəvətilə gəlmək; **to send out ~s** dəvətnamə göndərmək





**invite** [ɪn'vaɪt] *v* **1.** dəvət etmək, çağırmaq; **to ~ *smb.* to dinner** bir kəsi nahara dəvət etmək; **2.** meylləndirmək, təhrik etmək; cəzb etmək; **to ~ to speak frankly** bir kəsi açıq danışmağa təhrik etmək; **3.** oyatmaq, doğurmaq, xahiş etmək; **to ~ *smb.* to reconsider his decision** bir kəsdən qərarına yenidən baxmağı xahiş etmək
**inviting** [ɪn'vaɪtɪŋ] *adj* cəlbedici, cazibəli; cazibədar, şirnikdirici, tamahsılandırıcı; **~ look** cazibəli / cəlbedici baxış; **~ place** cəzbedici yer; **~ to the eye** gözoxşayan
**invoice**[1] ['ɪnvɔɪs] *n tic.* faktura; hesab; haqq-hesab; **to make out an ~** faktura yazmaq
**invoice**[2] ['ɪnvɔɪs] *v tic.* faktura / hesab yazmaq
**invoke** [ɪn'vouk] *v* çağırmaq; yalvarmaq, müraciət etmək; istəmək; **to ~ *smb.'s* aid** bir kəsdən kömək istəmək; **to ~ protection** müdafiə etməyə çağırmaq
**involuntary** [ɪn'vɔləntrɪ] *adj* **1.** qəsdən olmayan / edilməyən, bilməyərək edilmiş; **~ injury** təsadüfi zədə; **2.** qeyri-ixtiyari; **~ movement** qeyri-ixtiyari hərəkət; **3.** həvəssiz, istəmədən
**involve** [ɪn'vɔlv] *v* **1.** səbəb olmaq, törətmək, nəticələnmək; *Holidays involve expense Bayramlar xərcə səbəb olur;* **2.** cəlb etmək, qatmaq, sövq etmək; **to ~ a nation in war** ölkəni müharibəyə sövq etmək; **to ~ *smb.* in debt** bir kəsi borca salmaq; **to ~ *smb.* in a good deal of trouble** bir kəsi çoxpis vəziyyətə salmaq; **3.** dalmaq, məşğul olmaq; *She was involved in work O, işlə məşğul idi*
**involved** [ɪn'vɔlvd] *adj* çətin, dolaşıq, qarışıq; mürəkkəb; **~ mechanism** mürəkkəb mexanizm; **an ~ sentence** mürəkkəb cümlə; **an ~ explanation** dolaşıq izahat; **to be / to become / to get ~ in politics** siyasətə qarışmaq
**involvement** [ɪn'vɔlvmənt] *n* dolaşıqlıq, qarışıqlıq, çətinlik; mürəkkəblik
**invulnerable** [ɪn'vʌlnərəbl] *adj* alınmaz, toxunulmaz; **a fortification that is ~** alınmaz istehkam
**inward**[1] ['ɪnwəd] *adj* daxili; **~ nature** daxili aləm / mahiyyət; **~ joy / doubts** daxili sevinc / şübhələr
**inward**[2] ['ɪnwəd] *adv* içəri, içəriyə, daxilə; **to bend a thing ~** bir şeyi içəri / içəriyə əymək
**inwardly** ['ɪnwədlɪ] *adv* daxilən, öz-özünə; gizlin; **to be ~ grateful** daxilən minnətdar olmaq
**iodine** ['aɪədi:n] *n kim.* yod
**iota** [aɪ'outə] *n* ən cüzi / kiçik məbləğ, zərrə; *There is not an / one iota of truth in this story Bu hekayədə bir zərrə qədər həqiqət yoxdur*
**irate** [aɪ'reɪt] *adj* acıqlı, hirsli, qeyzli; qəzəbli, hiddətli; **~ customers demanding their money back** pulunun geri qaytarılmasını tələb edən hirsli müştərilər
**ire** ['aɪə$^r$] *n şair.* qəzəb, qeyz, hirs, acıq; kin; **to arouse / to provoke *smb.'s* ~** bir kəsi qəzəbləndirmək
**iridescent** [,ɪrɪdesnt] *adj* əlvan, rəngbərəng; rəngdən-rəngə çalan, bərq vuran; **~ feathers** əlvan lələklər
**Irish**[1] ['aɪrɪʃ] *n* **1.**: **the ~** *top.i* irlandiyalılar, İrlandiya xalqı; **2.** irland dili
**Irish**[2] ['aɪrɪʃ] *adj* İrlandiya; **the ~ Republic** İrlandiya Respublikası
**Irishman** ['aɪrɪʃmən] *n* irlandiyalı (*kişi*)
**Irishwoman** ['aɪrɪʃ,wumən] *n* irlandiyalı qadın
**irk** [ə:k] *v* acıqlandırmaq, hirsləndirmək, əsəbiləşdirmək; təngə gətirmək, bezdirmək; *It irks me to wait so long Belə uzun-uzadı gözləmək məni əsəbiləşdirir*
**irksome** ['ə:ksəm] *adj* yorucu, üzücü, hirsləndirici, əsəbiləşdirici; **~ task** yorucu / bezdirici tapşırıq
**iron**[1] ['aɪən] *n* **1.** *kim.* dəmir; qara metal; **made of ~** dəmirdən hazırlanmış; **a man of ~** dəmir iradəli adam; **muscles of ~** dəmir kimi əzələlər; **2.** ütü; **pressing / electric ~** dərzi / elektrik ütüsü
◊ *Strike while the iron is hot at.söz. Dəmiri isti-isti döyərlər*
**iron**[2] ['aɪən] *adj* **1.** dəmir, dəmirdən düzəldilmiş; **~ gate / door** dəmir darvaza / qapı; **2.** möhkəm, əyilməz, sarsılmaz; dəmir; **to have an ~ will** dəmir / möhkəm iradəyə malik olmaq
**iron**[3] ['aɪən] *v* **1.** ütüləmək; **to ~ a shirt** köynək ütüləmək; **2.** (**out**) qaydaya salmaq,

**petticoat** [ˈpetıkout] *n* **1.** alt tumanı, kombinasiya (*alt qadın paltarı*); **2.** *zaraf.* arvad, qız; **to be always after a ~** həmişə arvad / qız dalınca düşmək; **3.** bələk, qundaq

**pettifog** [ˈpetıfɔg] *v* **1.** ara qızışdırmaq; *They accepted the decision and did not pettifog Onlar qərar qəbul etdilər və bir daha ara qızışdırmadılar*; **2.** xırda şeylərə görə küsüşmək

**pettifogger** [ˈpetıfɔgəʳ] *n* **1.** süründürməçi; ərizəbaz; şər / böhtan atan, fitnəkar, araqı-zışdıran, dedi-qoduçu; **2.** şarlatan, yalançı, fırıldaqçı

**pettifoggery** [ˈpetıfɔgərı] *n* süründürməçilik, ərizəbazlıq

**pettifogging**[1] [ˈpetıfɔgıŋ] *n* **1.** süründürməçilik; məhkəməbazlıq; **2.** fırıldaq, hiyləgərlik, dələduzluq

**pettifogging**[2] [ˈpetıfɔgıŋ] *adj* **1.** məhkəməbaz, ərizəbaz; **2.** cəncəl, pis, çirkin; **3.** fırıldaqçı, hiyləgər, dələduz

**pettiness** [ˈpetınıs] *n* xırdaçılıq, kiçiklik, balacalıq

**petting** [ˈpetıŋ] *n d.d.* oxşama, nazlama, əzizləmə

**pettish** [ˈpetıʃ] *adj* **1.** küsəyən, dəymədüşər; **~ girl** küsəyən / dəymədüşər qız; **2.** əsəbi, hirsli; **~ speech** əsəbi / hirsli nitq

**petty** [ˈpetı] *adj* xırda, kiçik, balaca; cüzi, əhəmiyyətsiz; **~ cash** cüzi məbləğ; **~ reforms** cüzi islahatlar; **~ expenses** xırda / cüzi xərclər; **~ crime** xırda cinayət

**petulant** [ˈpetjulənt] *adj* **1.** səbirsiz, hövsələsiz; **a ~ and jealous wife** səbirsiz və qısqanc arvad; **2.** ədəbsiz, sözqaytaran; sırtıq; **~ children** sırtıq / həyasız uşaqlar

**phantasm** [ˈfæntæzm] *n* **1.** xəyal, vahimə, qarabasma, kabus; **2.** illüziya; xülya; **~ of a hope** qeyri-real ümid; *All this is a mere phantasm Bunlar hamısı sadəcə xülyadır*

**phantasma** [fænˈtæzmə] *n* **1.** illüziya, xülya, xəyal; **2.** kabus, qarabasma

**phantasmal** [fænˈtæzml] *adj* xəyali, qeyri-həqiqi; **~ imaginations** xəyali uydurmalar

**phantom** [ˈfæntəm] *n* **1.** xəyal, xəyalat, vahimə, qarabasma, kabus; **2.** illüziya, xülya; **3.** yalançı, əslində mövcud olmayan

**pharaoh** [ˈfeərou] *n tar.* firon (*qədim Misir hökmdarı*)

**pharmaceutical** [ˌfa:məˈsju:tıkl] *adj* əczaçılıq; **the ~ industry** əczaçılıq sənayesi; əczaçılıq; **~ scales** əczaçılıq tərəzisi

**pharmacist** [ˈfa:məsıst] *n* əczaçı

**pharmacological** [ˈfa:məkələdʒıkl] *adj* farmakologiya, əczaçılıq; farmakoloji; **~ faculty** farmakologiya / əczaçılıq fakültəsi; **~ research** farmakoloji tədqiqat

**pharmacologist** [ˌfa:məˈkələdʒıst] *n* farmakoloq, əczaçı

**pharmacology** [ˌfa:məˈkələdʒı] *n* farmakologiya

**pharmacy** [ˈfa:məsı] *n* **1.** əczaçılıq işi; **2.** aptek

**pharynx** [ˈfærıŋks] *n anat.* udlaq, hülqum

**phase**[1] [feız] *n* dövr, mərhələ, səfhə, pillə; **full ~** tam dövr (*ay haq.*); **~s of an illness** xəstəliyin mərhələləri; **to enter upon a new ~** yeni dövrə / mərhələyə daxil olmaq; **a ~ of history** tarixi dövr / mərhələ

**phase**[2] [feız] *v* **1.** dövrlərə / mərhələlərə bölmək; **2.** tədricən həyata keçirmək / tətbiq etmək; **to ~ new methods** tədricən yeni üsullar / metodlar tətbiq etmək

**phased** [feızd] *adj* tədrici, tədricən; **~ disarmament** tədrici / mərhələli tərk-silah

**pheasant** [ˈfeznt] *n* **1.** qırqovul; **2.** qırqovul ətindən hazırlanmış xörək

**phenol** [ˈfi:nɔl] *n kim.* fenol (*karbol turşusu*)

**phenomenal** [fıˈnɔmınl] *adj* nadir, görünməmiş, fövqəladə, qeyri-adi

**phenomenon** [fıˈnɔmınən] *n* (*pl* **-mena**) **1.** hadisə, fenomen (*həm də fəls*); **common ~** adi hadisə; **atmospheric ~** atmosfer hadisəsi; **linguistic ~** dil hadisəsi; **2.** *d.d.* qeyri-adi hadisə, möcüzə; **infant ~** möcüzə uşaq, vunderkind

**phial** [ˈfaıəl] *n* **1.** dərman üçün şüşə qab, şüşə (*dərman üçün*), flakon, ətir şüşəsi; **2.** qədəh, piyalə

**philander** [fıˈlændəʳ] *v* **1.** sürünmək (*qadın dalınca*), eşqbazlıq etmək, mazaqlaşmaq; **2.** əxlaqsızlıq etmək, pozğun həyat keçirmək / sürmək

**philanderer** [fıˈlændərəʳ] *n* **1.** qadın düşkünü, arvadbaz; donjuan; **2.** əxlaqsız / pozğun adam

**philanthrope** [ˈfılənθroup] *n* = **philanthropist**





**philanthropic** [ˌfılənˈθropık] *adj* filantrop; **~ organizations** filantropik / xeyriyyəçi təşkilatlar; **~ society** filantropik cəmiyyət (*xeyriyyə cəmiyyəti*)

**philanthropist** [fıˈlænθrəpıst] *n* filantrop, xeyriyyəçi

**philanthropize** [fıˈlænθrəpaız] *v* **1.** xeyriyyəçiliklə məşğul olmaq, xeyriyyəçilik etmək; **2.** himayə / himayəçilik / havadarlıq etmək; **to ~ the poor** kasıblara himayəçilik etmək

**philanthropy** [fıˈlænθrəpı] *n* filantropiya (*xeyriyyəçilik*)

**philatelist** [fıˈlætəlıst] *n* filatelist, filateliya ilə məşğul olan adam

**philharmonic** [ˌfıla:ˈmɔnık] *adj* filarmoniya; **~ society** filarmoniya cəmiyyəti

**philological** [ˌfıləˈlɔdʒıkl] *adj* filoloji, filologiya

**philologist** [fıˈlɔlədʒıst] *n* filoloq

**philology** [fıˈlɔlədʒı] *n* filologiya

**philosopher** [fıˈlɔsəfəʳ] *n* filosof; **the Greek ~ Aristotle** yunan filosofu Aristotel

**philosophical** [ˌfıləˈsɔfıkl] *adj* fəlsəfi, fəlsəfədən bəhs edən, fəlsəfəyə aid; **~ magazine** fəlsəfi / fəlsəfədən bəhs edən jurnal

**philosophically** [ˌfıləˈsɔfıkəlı] *adv* fəlsəfi baxımdan / cəhətdən

**philosophize** [fıˈlɔsəfaız] *v* filosof kimi düşünmək, filosofluq etmək

**philosophy** [fıˈlɔsəfı] *n* **1.** fəlsəfə; **the ~ of Aristotle** Aristotelin fəlsəfəsi; **2.** həyata / dünyaya baxış; ***one's* ~ of life** bir kəsin həyat haqqında fikri / baxışı

**phit** [fıt] *n* vıyıltı, vıyıltılı səs; **the ~ of the bullets** güllələrin vıyıltısı

**phlegm** [flem] *n* bəlğəm, hayxırıq

**phlegmatic** [flegˈmætık] *adj* fleqmatik, soyuqqanlı, laqeyd, süst; **in a ~ manner** soyuqqanlılıqla, laqeyd / süst bir tərzdə

**phlegmatically** [flegˈmætıkəlı] *adv* soyuqqanlılıqla, süst / laqeyd bir tərzdə

**phlegmy** [ˈflemı] *adj* **1.** selikli; **2.** = **phlegmatic**

**phoenix** [fi:nıks] *n əs.* **1.** simurq (*əfsanəvi quş*); **2.** möcüzə

**phone**[1] [foun] *n* (**telephone** *isminin qısa forması*) *d.d.* telefon; **on the ~ 1)** telefonda; **2)** telefonla; *Who is on the phone? Telefonda kimdir? Who answered the phone? Telefona kim cavab verdi?*; **to get *smb.* on the ~** bir kəsə telefon etmək; **to call *smb.* on the ~** bir kəsi telefona çağırmaq

**phone**[2] [foun] *v*: **to ~ (up) *smb.*** bir kəsə telefon etmək

**phoneme** [ˈfouni:m] *n dilç.* fonem

**phonemic** [fəˈni:mık] *adj* fonem, fonematik; **~ system of the language** dilin fonematik / fonem sistemi

**phonetic** [fouˈnetık] *adj* fonetik, fonetikaya aid olan

**phonetically** [fouˈnetıkəlı] *adv* fonetik baxımdan / cəhətdən

**phonetist** [fouˈnetıst] *n* fonetist, fonetika mütəxəssisi

**phonologic** [founəˈlɔdʒık] *adj dilç.* fonoloji, fonologiya; **the ~ system of the language** dilin fonoloji sistemi

**phonological** [founəˈlɔdʒıkl] *adj* = **phonologic**

**phonology** [fəˈnɔlədʒı] *n dilç.* fonologiya

**phonoscope** [ˈfounəskoup] *n dilç.* fonoskop (*nitqin fonetik xüsusiyyətlərini tədqiq etmək üçün cihaz*)

**phosphate** [ˈfɔsfeıt] *n kim.* fosfat, fosfat turşusu

**phosphorous** [ˈfɔsfərəs] *adj kim.* fosforlu, tərkibində fosfor olan

**phosphorus** [ˈfɔsfərəs] *n kim.* fosfor

**photo**[1] [ˈfoutou] *n d.d.* fotoqrafiya; **a colour ~** rəngli fotoqrafiya; **to take ~** şəkil / fotoqrafiya çəkmək

**photo**[2] [ˈfoutou] *v d.d.* foto ilə şəkil çəkmək; *We were photoed full-length Biz bədənnüma şəkil çəkdirdik*

**photogenic** [ˌfoutouˈdʒenık] *adj* fotogenik, ifadəli, fotoqrafiya üçün əlverişli; **~ face** fotogenik sifət / üz

**photograph**[1] [ˈfoutəgra:f] *n* fotoqrafiya, şəkil; **to take a ~** şəkil çəkmək; **to have *one's* ~ taken** şəklini çəkdirmək

**photograph**[2] [ˈfoutəgra:f] *v* **1.** foto ilə şəkil çəkmək; **2.** yaddaşına həkk olunmaq, yadda saxlamaq

**photographer** [fəˈtɔgrəfəʳ] *n* fotoqraf, fotoqrafçı; **an amateur ~** həvəskar fotoqraf; **a professional ~** sənətkar / professional fotoqraf

**photographic** [foutə'græfık] *adj* fotoqrafik; ~ **print** fotoqrafik çap
**photography** [fə'tɔgrəfı] *n* fotqrafiya, foto ilə çəkilmiş şəkil
**phrasal** ['freızl] *adj* frazeoloji, tərkibi; ~ **verbs** tərkibi / frazeoloji fellər
**phrase**[1] [freız] *n* **1.** *qram.* fraza, ifadə, söz birləşməsi; **graceful ~s** gözəl ifadələr; **2.** idiomatik ifadələr
**phrase**[2] [freız] *v* **1.** sözlərlə ifadə etmək; **2.** adlandırmaq, xarakterizə etmək
**phrase-book** ['freızbuk] *n* frazeoloji lüğət (*ikidilli*)
**phraseological** [,freızıə'lɔdʒıkl] *adj* frazeoloji; ~ **combination / unit** frazeoloji birləşmə / vahid
**phraseology** [,freızı'ɔlədʒı] *n dilç.* **1.** frazeologiya; **2.** təmtəraqlı cümlələr, cümləpərdazlıq
**physic** ['fızık] *n d.d.* dərman; **to give** *smb.* **a dose of** ~ bir kəsə bir doza dərman vermək
**physical** ['fızıkl] *adj* **1.** fiziki, maddi; ~ **strength / force** fiziki qüvvə / güc; ~ **map** fiziki xəritə; ~ **chemistry** fiziki kimya; ~ **geography** fiziki coğrafiya; **2.** cismi, cismani; ~ **drills 1)** gimnastik təmrinlər; **2)** məşq; ~ **examination** tibbi müayinə
**physically** ['fızıkəlı] *adv* cismən, bədəncə; *He's very weak physically O, bədəncə çox zəifdir*
**physical therapy** ['fızıkl'θerəpı] *n tib.* fizioterapiya
**physician** [fı'zıʃn] *n* həkim, terapevt
**physicist** ['fızısıst] *n* fizik, fizika mütəxəssisi
**physics** ['fızıks] *n* fizika; **cosmical** ~ kosmik fizika; **quantum** ~ kvant fizikası; **nuclear** ~ nüvə / atom fizikası; **the laws of** ~ fizikanın qanunları
**physiognomist** [,fızı'ɔnəmıst] *n* fizionomist
**physiognomy** [,fızı'ɔnəmı] *n* **1.** fizionomika; **2.** sima, sifət, sir-sifət; **the political ~ of the new parliament** yeni parlamentin siyasi sifəti / siması
**physiologic** [,fızıə'lɔdʒık] *adj* fizioloji; ~ **changes** fizioloji dəyişikliklər; ~ **adaptation** fizioloji uyğunlaşma
**physiological** [,fızıə'lɔdʒıkl] *adj* = **physiologic**
**physiologically** [,fızıə'lɔdʒıkəlı] *adv* fizioloji baxımdan / nöqteyi-nəzərdən
**physiologist** [,fızı'ɔlədʒıst] *n* fizioloq, fiziologiya mütəxəssisi
**physiology** [,fızı'ɔlədʒı] *n* fiziologiya
**physiotherapist** [,fızıou'θerəpıst] *n* fizioterapevt
**physiotherapy** ['fızıou'θerəpı] *n tib.* fizioterapiya
**physique** [fı'zi:k] *n* bədən, bədən quruluşu, qədd-qamət; **a fine / well-developed** ~ əla / yaxşı inkişaf etmiş bədən
**pianino** [pjæ'ni:nou] *n* (*pl* **-os** [-ouz]) pianino
**pianist** ['pjænıst] *n mus.* pianoçu, pianoçalan; **a famous** ~ tanınmış pianist
**piano** [pı'ænou] *n* (*pl* **-os** [-ouz]) fortepiano; royal; **grand** ~ royal
**piano-player** ['pıænou,pleıəʳ] *n* = **pianist**
**picaresque** [,pıkə'resk] *adj* hiyləgərlik; hiyləgər, bic
**pick**[1] [pık] *n* I şişuclu / sivriuclu külüng
**pick** [pık] *n* II **1.** seçim, seçmə; **to take** *one's* ~ seçmək, öz seçimini etmək; *Which one would you like? Take your pick Hansını istəyirsən / istəyirsiniz? Seç / Seçin*; **2.** bir şeyin seçilmiş hissəsi; **the ~ of the army** ordunun seçilmiş hissəsi; **3.** məhsulun birdəfəlik yığılan hissəsi (*meyvə, giləmeyvə və s. haq.*); *The first pick of strawberries is off Çiyələyin ilk yığımı oldu*; **4.** zərbə (*iti alətlə vurulan*); **to take a** ~ vurmaq (*iti alətlə*)
**pick**[2] [pık] *v* **1.** seçmək, ayırmaq; **to ~ the best** ən yaxşısını seçmək; *They picked the most deserving candidate Onlar ən layiqli namizədi seçdilər*; **2.** yığmaq, dərmək; götürmək; **to ~ flowers / fruit / berries** çiçək / meyvə / giləmeyvə yığmaq; **3.** (**out of**) çıxartmaq; **to ~ a thorn out of** *one's* **finger** barmağından tikan çıxartmaq; **4.** axtarmaq; **to ~ an occasion** münasib fürsət axtarmaq; **5.** dənləmək, dimdikləmək; *Hens were picking grain Toyuqlar taxılı dənləyirdi;* **6.** eşələmək; qurdalamaq; **to ~** *one's* **nose** burnunu eşələmək (*yəni təmizləmək*); **to ~** *one's* **teeth** dişlərini qurdalamaq; **7.** deşmək, deşik açmaq; **to ~ a hole** deşik açmaq; **8.** torpağı küLünglə yumşaltmaq; **9.** yolmaq (*toyuğu və s.*); **10.** didmək (*yunu, pambığı və s.*);





**11.** oğurlamaq; **to ~** *smb.'s* **pocket** bir kəsin cibinə girmək;
◊ **to ~ and choose** vasvası / tələbkar olmaq; **to ~ and steal** xırda oğurluqla məşğul olmaq; **to ~ a bone with** *smb.* bir kəslə hesabı çürütmək / haqq-hesab çəkmək; **to ~ up flesh** kökəlmək; **to ~ up** *one's* **spirit / courage** cəsarət toplamaq; *I picked up my courage and spoke without trepidation Mən cəsarətimi topladım və həyəcansız danışdım*; **to ~** *one's* **words** ağzından çıxan sözü bilmək; **to ~** *one's* **way** yolunu seçmək
**pick-a-back** ['pıkəbæk] *adv* çiynində, dalında; **to carry** *smb.* ~ bir kəsi dalında aparmaq
**picked** [pıkt] *adj* seçmə, seçilmiş; ~ **craftsmen** seçilmiş ustalar; ~ **troops** *hərb. d.d.* seçmə hissələr; ~ **team** *id.* seçmə komanda
**picker** ['pıkəʳ] *n* **1.** toplayan, yığan (*meyvə, pambıq və s.*); **2.** cındırçı, cındıryığan, cındır alan; **3.** xırda şeylər oğrusu; **4.** çeşidləyici, malları növlərə ayıran; **5.** kərki, toxa
**picket**[1] ['pıkıt] *n* I **1.** piket; **strike** ~ tətilçilərin piketi; **to be on** ~ piketdə olmaq; **2.** kiçik qarovul dəstəsi; zastava, qarovulxana
**picket** ['pıkıt] *n* II paya
**picket**[2] ['pıkıt] *v* I **1.** piket təşkil etmək; **2.** növbə çəkmək, mühafizə etmək
**picket** ['pıkıt] *v* II ətrafına paya vurmaq, ətrafını payalamaq
**picketed** ['pıkıtıd] *adj* I piketlə əhatə olunmuş / edilmiş; ~ **works** piketlə əhatə olunmuş zavod
**picketed** ['pıkıtıd] *adj* II ətrafına paya vurulmuş, ətrafı payalanmış; ~ **garden** ətrafına paya vurulmuş bağ / bağça
**picking** ['pıkıŋ] *n* **1.** oğurluq; **2.** *pl.* qalıq, artıq, yemək artığı, qabaqdan qalan; **3.** yığma, toplama (*məhsulu, meyvəni*); **4.** seçmə, sortlara ayırma; **5.** tüklərini yolma (*toyuq və s. haq.*)
**pickle**[1] ['pıkl] *n* **1.** şoraba; şoraba suyu; **2.** duza qoyulmuş xiyar; həftbecər; **3.** *d.d.* acınacaqlı / xoşagəlməz vəziyyət; **to be in a pretty / nice / fine** ~ çətin / xoşagəlməz / acınacaqlı vəziyyətdə olmaq; *I could see no way out of the pickle I was in Mən düşdüyüm çətin vəziyyətdən heç bir çıxış yolu görə bilmirdim*; **4.** nadinc, dəcəl, şuluqçu
**pickle**[2] ['pıkl] *v* duza / turşuya / marinada qoymaq (*tərəvəzi, meyvəni*); **to ~ cucumber / onion / tomato / cabbadge** xiyarı / soğanı / pomidoru / kələmi turşuya qoymaq;
◊ **to ~ a rod for** *one's* **own back** ≡ özünə quyu qazmaq
**pickled** ['pıkld] *adj* duza / turşuya / marinada qoyulmuş; ~ **cabbage** duza / turşuya / marinada qoyulmuş kələm; ~ **cucumber** duza / turşuya / marinada qoyulmuş xiyar
**pickler** ['pıkləʳ] *n* **1.** turşuya / duza / marinada qoymaq üçün yetişdirilən tərəvəz; **2.** şoraba, şoraba suyu; **3.** şoraba qoymaq üçün banka
**pickpocket** ['pık,pɔkıt] *n* cibgir, cibkəsən
**picky** ['pıkı] *adj* tələbkar, hər şeyi bəyənməyən
**picnic**[1] ['pıknık] *n* **1.** piknik (*seyr, seyrə çıxma, çölə gəzintiyə getmə*); **to hold a ~ in the forest** meşədə piknik təşkil etmək; **to go on / for a** ~ piknikə getmək; **2.** asan / yüngül iş; *It's no picnic having to look after 6 small children all day Bütün günü 6 balaca uşağa baxmaq asan iş deyil*
**picnic**[2] ['pıknık] *v* piknikə getmək, seyrə çıxmaq
**picnicker** ['pıknıkəʳ] *n* piknikə gedən, piknikdə iştirak edən, seyrə çıxan, gəzməyə gedən; *Picnickers are requested not to leave litter Gəzintiyə gələnlərdən xahiş olunur ki, özlərindən sonra zir-zibil qoymasınlar*
**pictorial**[1] [pık'tɔ:rıəl] *n* şəkilli nəşr; **the Lady's** ~ qadınlar üçün şəkilli jurnal
**pictorial**[2] [pık'tɔ:rıəl] *adj* **1.** şəkilli; **a ~ dictionary** şəkilli lüğət; **2.** təsviri; ~ **art** təsviri incəsənət; **3.** *dilç.* piktoqrafik; ~ **script** piktoqrafik yazı
**picture**[1] ['pıktʃəʳ] *n* **1.** şəkil, tablo, rəsm; **to paint / to draw a** ~ şəkil / rəsm / tablo çəkmək; **to hang a ~ on the wall** divardan şəkil / tablo asmaq; **2.** fotoqrafiya, foto ilə çəkilmiş şəkil; *They showed us their wedding pictures Onlar bizə toy şəkillərini göstərdilər*; **3.** (**the ~ s**) kino; **to**

**go to the ~s** *d.d.* kinoya getmək; **4.** kinofilm; kino şəkli; **black-and-white / colour ~** ağ-qara / rəngli film;
◊ **to come into the ~** görünmək, zahir / peyda olmaq; **to bring into the ~** cəlb / daxil etmək, xatırlatmaq, toxunmaq

**picture[2]** [ˈpɪktʃər] *v* **1.** təsvir etmək, surətini yaratmaq (*səhnədə*), çəkmək; *On the wall he has pictured a mountain Divarda o, dağ şəkli çəkdi / dağı təsvir etdi*; **2.** foto ilə şəkil çəkmək; **3.** canlı şəkildə təsvir etmək; *He has pictured the child very vividly O, uşağı çox canlı təsvir edib*

**picture-book** [ˈpɪktʃəbuk] *n* şəkilli kitab (*xüs. uşaqlar üçün*)

**pictured** [ˈpɪktʃəd] *adj* **1.** çəkilmiş (*şəkil*); **2.** şəkillə bəzədilmiş; **3.** şəkilli, rəsmli; **a ~ book** şəkilli kitab

**picture-frame** [ˈpɪktʃəfreɪm] *n* şəkil üçün çərçivə

**picture gallery** [ˈpɪktʃə,gælərɪ] *n* şəkil qalereyası

**picture-making** [ˈpɪktʃə,meɪkɪŋ] *n* kino istehsalı

**picture palace** [ˈpɪktʃə,pælɪs] *n* kinoteatr

·**picture-show** [ˈpɪktʃəʃou] *n* **1.** şəkil sərgisi; **2.** kinofilm

**picturesque** [,pɪktʃəˈresk] *adj* gözəl, mənzərəli; **a very ~ scene** çox gözəl / mənzərəli səhnə

**piddle** [ˈpɪdl] *v* siymək, işəmək

**piddling** [ˈpɪdlɪŋ] *adj* xırda, boş, mənasız; **~ concerns** xırda qayğılar

**pie** [paɪ] *n* piroq; **meat / potato / apple ~** ət / kartof / alma piroqu;
◊ **to have a finger in every ~** hər şeydə barmağı olmaq

**piece[1]** [pi:s] *n* **1.** parça, tikə; bir parça / tikə; **a ~ of bread** bir parça / tikə çörək; **a ~ of sugar** bir tikə / parça qənd; **a ~ of chalk** bir parça / tikə təbaşir; **to be in ~s** parça-parça / tikə-tikə olmaq; *The cup was in pieces Fincan parça-parça / tikə-tikə olmuşdu*; **to take to ~s** sökmək, hissələrinə ayırmaq; **to take a clock to ~s** saatı sökmək; **to take a dress to ~s** paltarı sökmək; **2.** sahə; **a ~ of potatoes** kartof sahəsi; **3.** dənə; **to sell goods by the ~** malı dənə-dənə satmaq; **4.** tablo, şəkil; incəsənət əsəri; **a ~ of art** incəsənət əsəri; **5.** qısa həcmli ədəbi əsər; **a ~ of poetry** şer; **to speak / to recite a ~ 1)** ifadəli oxumaq (*bədii əsəri*), təmtəraqla söyləmək; **2)** nitq söyləmək; **6.** sikkə; pul; **a ~ of gold / of silver** qızıl / gümüş sikkə; **7.** *şahm.* fiqur (*şahmatda böyük daşların adı: şah, vəzir, fil və s.*); **pawns and ~s** piyadalar və fiqurlar; **heavy / minor ~** ağır / yüngül fiqurlar; **8.** *hərb.* atəş vasitələri; silah; **9.** *id.* idman alətləri;
◊ **a ~ of work 1)** əsər, iş; **a splendid ~ of work** çox gözəl əsər; **2)** çətin iş; *This translation is such a piece of work Bu tərcümə çox çətin işdir*; **3)** səs, səs-küy; dava-dalaş, qalmaqal; *He kept jawing us, and making a piece of work all the time O, bütün müddəti bizi danladı və qalmaqal saldı*; **to know *smth.* all to ~s** bir şeyi tam / kamil bilmək; **to go / to come to ~s 1)** məhv / həlak / puç / yox olmaq; **2)** ruhdan düşmək; əldən / gücdən düşmək; *In the second half their team went all to pieces Oyunun ikinci hissəsində onların komandası əldən düşdü*

**piece[2]** [pi:s] *v* **1.** birləşdirmək, ayrı-ayrı hissələrdən yığmaq / tikmək; **to ~ a quilt** parça tikələrindən yorğan tikmək; **2.** təmir etmək, yamamaq, çitəmək; *She was piecing her skirt O, yubkasını yamayırdı*; **to ~ together** birləşdirmək; **to ~ a broken cup together** sınmış fincanı birləşdirmək / yapışdırmaq; **to ~ out a shortage** çatışmazlığı ödəmək; **to ~ up** təmir etmək, yamamaq; bərpa etmək

**piece-goods** [ˈpi:sgudz] *n* ədədi mallar; dənə-dənə istehsal olunan mallar

**pieceless** [ˈpi:slɪs] *adj* tam, bölünməz, vahid, bütöv

**piecemeal** [ˈpi:smi:l] *adv* **1.** hissə-hissə, natamam, tədricən; *He does his work piecemeal O, işini hissə-hissə görür*; **2.** parça-parça, xıncım-xıncım, tikə-tikə; **to break *smth.* ~** bir şeyi sındırıb tikə-tikə etmək

**piecework** [ˈpi:swə:k] *n* dənəmuzd iş

**pied** [paɪd] *adj* bəzəkli; alabəzək; **~ birds** alabəzək quşlar

**pierce** [pɪəs] *v* **1.** deşmək, dəlmək; sancmaq; vurub / dəlib keçmək; **to ~ a rubber ball** rezin topu deşmək; *The needle pierced her finger İynə onun barmağını deşdi*; **to have *one's* ears ~ed** qulaqlarını deşdirmək; **2.** deşik açmaq; deşmək; **to ~ a hole** deşik açmaq; **3.** keçmək, girmək; *We pierced the jungle by means of the river Biz cəngəlliyə çay vasitəsilə keçdik*; **to ~ into / through the enemy's line** düşmən xəttini keçmək; **4.** dərk etmək, anlamaq, başa düşmək; **to ~ the mysteries** sirləri anlamaq; *He failed to pierce the cause O, səbəbi anlaya bilmədi*; **5.** arasından keçmək





**pierced** [pɪəsd] *adj* deşilmiş, dəlinmiş, deşik / dəlik açılmış; **~ ears** deşilmiş qulaqlar

**piercing** [ˈpɪəsɪŋ] *adj* **1.** iti; **~ dart** iti ox; **2.** çox bərk / kəskin / güclü; sümüyə / iliyə işləyən **~ wind** çox bərk / güclü / sümüyə / iliyə işləyən külək; **3.** ağıllı; **~ black eyes** ağıllı qara gözlər; **4.** *hərb.* zirehdeşən; **~ shell** zirehdeşən mərmi / güllə

**piercingly** [ˈpɪəsɪŋlɪ] *adv* kəsən, iliyə işləyən, bərk, kəskin

**piety** [ˈpaɪətɪ] *n* **1.** dindarlıq, möminlik, zahidlik; **2.** valideynlərə, böyüklərə və s. hörmət

**piffle[1]** [ˈpɪfl] *n d.d.* cəfəngiyyat, boşboğazlıq, boş danışıq / söhbət, uydurma, yalan; **to talk ~** cəfəngiyyat danışmaq

**piffle[2]** [ˈpɪfl] *v d.d.* **1.** cəfəngiyyat danışmaq, boşboğazlıq etmək; **2.** ehtiyatsız / fikirləşmədən hərəkət etmək

**piffler** [ˈpɪflər] *n d.d.* boşboğaz, çoxdanışan, çərənçi

**piffling** [ˈpɪflɪŋ] *adj d.d.* cüzi, əhəmiyyətsiz, dəyərsiz; **to busy oneself with ~ jobs** əhəmiyyətsiz / dəyərsiz işlə məşğul olmaq

**pig[1]** [pɪg] *n* **1.** donuz; **2.** iri çoşka; **roast ~** qızardılmış çoşka; **3.** *d.d.* donuz; sırtıq, utanmaz, nacins, nankor, həyasız, ədəbsiz (*adam*); **4.** pinti; natəmiz (*adam*); **5.** *amer.* əxlaqsız / pozğun qadın;
◊ **to make a ~ of oneself** çox / həddindən artıq yemək; **to eat like a ~** donuz kimi yemək; **to buy a ~ in a bag** ≅ bir şeyi görmədən və bilmədən almaq

**pig[2]** [pɪg] *v* (**-gg-**) **1.** çoşkalamaq, balalamaq (*donuz haq.*); **2.** donuz kimi çirk içində yaşamaq; **3.** həddindən çox yemək, donuz kimi yemək

**pigeon** [ˈpɪdʒən] *n* **1.** *zool.* göyərçin; **2.** *d.d.* sadədil, sadəlövh, sadə (*adam*)

**pigeon-fancier** [ˈpɪdʒən,fænsɪər] *n* quşbaz, göyərçinbaz

**pigeon-hearted** [ˈpɪdʒɪnˈha:tɪd] *adj* qorxaq, qorxacaq, ürəksiz, cəsarətsiz, ağciyər

**pigeon-hole[1]** [ˈpɪdʒɪnhoul] *n* **1.** göyərçin yuvası; **2.** ağıl, yataq, tövlə; qazma

**pigeon-hole[2]** [ˈpɪdʒɪnhoul] *v* **1.** kağızları qutulara yerləşdirmək; **2.** süründürməçiliyə / təxirə salmaq; **3.** təsnif etmək; **to ~ facts** faktları / dəlilləri təsnif etmək

**pigeon-post** [ˈpɪdʒɪnpoust] *n* göyərçin poçtu

**pigeonry** [ˈpɪdʒɪnrɪ] *n* göyərçin damı

**piggery** [ˈpɪgərɪ] *n* donuz damı

**piggish** [ˈpɪgɪʃ] *adj* **1.** donuz kimi; donuzaoxşar, donuzabənzər; donuz; **small ~ eyes** balaca donuz gözünə bənzər gözlər; **2.** hisli-paslı, kirli, murdar

**piggishly** [ˈpɪgɪʃlɪ] *adv* donuz kimi; hisli-paslı, çirkin içində, murdarcasına

**piggishness** [ˈpɪgɪʃnɪs] *n* **1.** çirklilik, natəmizlik, murdarlıq; **2.** əclaflıq, nacinslik

**piggy[1]** [ˈpɪgɪ] *n* çoşqa, donuz balası

**piggy[2]** [ˈpɪgɪ] *adj* donuz kimi, donuzaoxşar, donuzabənzər; *He had little piggy eyes Onun donuz gözünə bənzəyən balaca gözləri vardı*

**pigheaded** [,pɪgˈhedɪd] *adj* **1.** tərs, inad, inadcıl, inadkar, kəc; **2.** gic, axmaq, səfeh

**pigheadedly** [,pɪgˈhedɪdlɪ] *adv* inadla, inadkarlıqla, inadkar / kəc bir tərzdə

**pigheadedness** [,pɪgˈhedɪdnɪs] *n* tərslik, inadkarlıq, kəclik, inadcıllıq

**piglet** [ˈpɪglɪt] *n* çoşqa, donuz balası

**pigment** [ˈpɪgmənt] *n* **1.** *biol.* piqment; **2.** boyaq maddəsi

**pigmentation** [pɪgmənˈteɪʃn] *n fiziol.* piqmentasiya

**pigskin[1]** [ˈpɪgskɪn] *n* donuz dərisi

**pigskin[2]** [ˈpɪgskɪn] *adj* donuz dərisindən hazırlanmış; **~ gloves** donuz dərisindən hazırlanmış əlcək

**pigsty** [ˈpɪgstaɪ] *n* **1.** donuz damı; **2.** *məc.* çirkli / natəmiz / murdar yer, pəyə

**pigtail** [ˈpɪgteɪl] *n d.d.* hörük (*qısa*); **schoolgirls in ~s** qısa hörüklü məktəbli qızlar

**pike** [paɪk] *n* I *zool.* durnabalığı

**pike** [paɪk] *n* II **1.** ucluq (*oxda, nizədə və s.*); **2.** külüng; **3.** mizraq (*qədim döyüş aləti*)

**pike** [paɪk] *n* III dağın şiş təpəsi; ot tayasının təpəsi

**piked** [paɪkt] *adj* sivri, sivriuclu, şiştəpəli

**pilaf** [ˈpi:læf, pɪˈla:f] *n* (*həm də* **pilau** [ˈpi:lau]) plov

**pilchard** [ˈpɪltʃəd] *n zool.* sardina

**pile**[1] [paɪl] *n* I **1.** paya, dirək; **bridge ~** körpü dirəyi; **to drive in a ~** paya vurmaq; **2.** ot saplağı, ot gövdəsi

**pile** [paɪl] *n* II **1.** bağlama, topa, yığın, qalaq; **a ~ of books** bir bağlama kitab; **a ~ of stones** bir topa / yığın daş; **a ~ of logs** bir qalaq / yığın şalban; **a ~ of wood** bir qalaq odun; **2.** dəfn tonqalı (*bəzi ölkələrdə, məs. Hindistanda meyiti yandırmaq üçün qalanan*); **3.** nəhəng bina; **4.** *d.d.* var-dövlət, çoxlu pul; **to make *one's* ~** var-dövlət yığmaq; **5.** *fiz.* nüvə reaktoru; **uranium ~** uran reaktoru

**pile** [paɪl] *n* III **1.** yun; tük; narın tük; **2.** tiftik; **the thick ~ of a bath towel** hamam dəsmalının qalın tiftiyi

**pile**[2] [paɪl] *v* I paya vurmaq

**pile** [paɪl] *v* II **1.** topa yığmaq, sıra ilə üst-üstə yığmaq; **to ~ logs on each other** şalbanları sıra ilə üst-üstə yığmaq; *Money was slowly piled up by his father Pulu onun atası yavaş-yavaş / tədricən yığdı*; **2.** yükləmək, yük vurmaq; bir-birinin üstünə tökmək / yığmaq; **to ~ coal on a fire** ocağa kömür tökmək; **3.** *d.d.* hərəkət etmək; bir yerə toplaşmaq; *The tourists piled towards the exit Turistlər çıxışa toplaşdılar*

**piles** [paɪlz] *n pl tib.* babasil

**pilfer** [ˈpɪlfəʳ] *v* oğurlamaq, aparmaq, çırpışdırmaq

**pilferage** [ˈpɪlfərɪdʒ] *n hüq.* xırda oğurluq

**pilferer** [ˈpɪlfərəʳ] *n* xırda şeylər oğrusu

**pilfering** [ˈpɪlfərɪŋ] *n* xırda oğurluq

**pilgrim**[1] [ˈpɪlgrɪm] *n* ziyarətçi, zəvvar; **muslim ~s on their way to Mecca** Məkkəyə gedən müsəlman ziyarətçiləri / zəvvarları

**pilgrim**[2] [ˈpɪlgrɪm] *v* ziyarətə getmək

**pilgrimage** [ˈpɪlgrɪmɪdʒ] *n* **1.** zəvvarlıq, ziyarət; **to go on a ~** ziyarətə getmək; **2.** *d.d.* səyahət etmə, gəzmə; səyahət; **3.** ziyarətgah, ziyarət yeri; **a ~ to Shakespeare's birthplace** Şekspirin doğulduğu yerə səyahət

**pill** [pɪl] *n* həb; **to take a ~ 1**) həb qəbul etmək; **a vitamin ~** vitamin həbi; *Take a pill daily after meals Yeməkdən sonra gündə bir həb qəbul et / edin*; **2**) *d.d.* işlətmə dərmanı qəbul etmək

**pillage**[1] [ˈpɪlɪdʒ] *n* qarət, soyğunçuluq, talan, quldurluq; talançılıq

**pillage**[2] [ˈpɪlɪdʒ] *v* soymaq, qarət etmək, talamaq, çalıb-çapmaq; *The town was pillaged by the invading army İstilaçı ordu şəhəri talan etdi / çapıb-taladı*

**pillar**[1] [ˈpɪləʳ] *n* **1.** sütun, dirək; **2.** *tik.* dayaq; **3.** sütun (*tüstü, alov və s.*); **a ~ of fire / of smoke** alov / tüstü sütunu

**pillar**[2] [ˈpɪləʳ] *v* paya ilə dayaq vermək / vurmaq

**pillar-box** [ˈpɪləbɔks] *n* küçədə qoyulmuş poçt qutusu

**pillar-post** [ˈpɪləpoust] *n* = **pillar-box**

**pill-box** [ˈpɪlbɔks] *n* **1.** həb saxlamaq üçün qutu; **2.** *hərb.* uzunmüddətli atəş istehkamı

**pillion**[1] [ˈpɪlıən] *n* motosikletin dal oturacağı

**pillion**[2] [ˈpɪlıən] *adj* motosiklet oturacağında oturan

**pillion-rider** [ˈpɪljən,raɪdəʳ] *n* motosikletin dal oturacağında gedən (*adam*)

**pillion-seat** [ˈpɪljənsi:t] *n* motosikletin dal oturacağı

**pillory**[1] [ˈpɪlərı] *n* **1.** *tar.* rüsvayçılıq payası; **2.** *məc.* gülünc, masqara, oyuncaq yerinə qoyulma; **to be in the ~** gülünc vəziyyətdə qalmaq / olmaq

**pillory**[2] [ˈpɪlərı] *v* **1.** *tar.* rüsvayçılıq payasına vurmaq; **2.** biabır / rüsvay etmək

**pillow**[1] [ˈpɪlou] *n* yastıq, balış; **to plump up the ~s** balışları doldurmaq;

◊ **to take counsel of / to consult with *one's* ~** ≅ *Axşamın xeyrindən səhərin şəri yaxşıdır*

**pillow**[2] [ˈpɪlou] *v* **1.** başını qoymaq (*bir şeyin üstünə*); *He pillowed his head on his hand O, başını əlinin üstünə qoydu*; **2.** balınc / yastıq qoymaq; *He was blanketed and pillowed Onun üstünə yorğan saldılar və başının altına balış / yastıq qoydular*

**pillowcase** [ˈpɪloukeɪs] *n* balışüzü, yastıqüzü

**pillowfight**[1] [ˈpɪloufaɪt] *n* balış davası

**pillowslip** [ˈpɪlouslɪp] *n* = **pillowcase**





**pilot**[1] [ˈpaɪlət] *n* **1.** təyyarəçi, pilot; **~ on alert, alert ~** növbətçi pilot; **2.** losman; **3.** bələdçi, başçı, yolgöstərən

**pilot**[2] [ˈpaɪlət] *v* **1.** sürmək; idarə etmək; **to ~ a plane** təyyarə sürmək; **to ~ a ship** gəmi sürmək; **2.** aparmaq, bələdçilik etmək; *He piloted us to the caves O, mağaralarda bizə bələdçilik etdi*;

◊ **to ~ a bill** *amer.* qanun layihəsini palatadan keçirmək

**pimp**[1] [pɪmp] *n d.d.* vasitəçi, aradüzəldən, oğraş; **2.** *amer.* alçaq, əclaf

**pimp**[2] [pɪmp] *v* **1.** vasitəçilik etmək; ara düzəltmək, oğraşlıq etmək

**pimple** [ˈpɪmpl] *n tib.* sızanaq; civzə

**pimpled** [ˈpɪmpld] *adj* = **pimply**

**pimply** [ˈpɪmplı] *adj* sızanaqlı; **~ skin** sızanaqlı dəri; **a ~ youth** üzü sızanaqlı cavan

**pin**[1] [pɪn] *n* **1.** sancaq; şpilka, baş sancağı; broşka (*bəzək sancağı*); nişan; **2.** knopka, basmadüymə (*dəftərxanada işlədilən*); **3.** sıxac; **4.** *tex.* ox mili (*arabada*); **5.** *pl d.d.* ayaqlar; *He's quick on his pins O, ayaqdan itidir / yüngüldür; He is weak on his pins O, ayaqları üstündə güclə dayanır*; **6.** çəllək; **~ of beer** bir çəllək pivə;

◊ **to be on ~s and needles** ≅ tikan üstündə oturmaq; **to let loose a ~** sərxoşluğa / içməyə başlamaq; **to put in the ~** içməyi tərgitmək; **to look for a ~'s head in a cartload of hay** ≅ ot tayasında iynə axtarmaq

**pin**[2] [pɪn] *v* (**-nn-**) **1.** sancaqlamaq, sancaqla bənd etmək; **to ~ the paper to the board** kağızı sancaqla lövhəyə bənd etmək; **to ~ papers together** kağızları bir yerə sancaqlamaq; **to ~ clothes to a line** paltarları kəndirə sancaqlamaq; **2.** deşmək, dəlmək, sancaqlamaq; tıxamaq, tutmaq; **to ~ insects** həşəratları sancaqlamaq (*kolleksiyaya*); **to ~ holes** deşikləri tutmaq; **3.** basıb / sıxıb əzmək; *He was pinned down by a fallen tree Yıxılan ağac onu basıb əzdi*; **4.** *id.* kürəklərini yerə vurmaq; **5.** bərk tutmaq / yapışmaq; **to ~ *smb.* by the throat** bir kəsin boğazından bərk-bərk tutmaq / yapışmaq; **6.** salmaq; *The cattle were pinned Naxırı xalxala saldılar*; **7.** *d.d.* oğurlamaq, çırpışdırmaq; *I'm sure they intended to pin my money Mən əminəm ki, onlar mənim pulumu çırpışdırmaq fikrinə düşmüşdülər*;

◊ **to ~ *smth.* on *smb.*** günahı bir kəsin boynuna qoymaq; **to ~ *one's* faith on *smb.* / *smth.*** bir kəsə / şeyə kor-koranə inanmaq

**pinafore** [ˈpɪnəfɔ:ʳ] *n* önlük, döşlük

**pin-case** [ˈpɪnkeɪs] *n* iynədan, iynə-sancaq qabı

**pince-nez** [ˌpænsˈneɪ] *n* (*cəmdə dəyişmir*) pensne (*eynək*)

**pincers** [ˈpɪnsəz] *n* **1.** kəlbətin; (*həm də* **a pair of ~**); **2.** pinset, maqqaş

**pincer** [ˈpɪnsəʳ] *v* **1.** kəlbətinlə / maqqaşla sıxmaq; **2.** *məc.* əziyyət / əzab vermək, incitmək

**pinch**[1] [pɪntʃ] *n* **1.** çimdik, çimdikləmə, çimdik götürmə; **to give *smb.* a ~** bir kəsi çimdikləmək; *She gave the boy a pinch on the arm O, oğlanın qolundan çimdiklədi*; **2.** sıxma, sıxılma; **the ~ of shoes** ayaqqabının sıxması; **3.** bir çimdik; **a ~ of salt** bir çimdik duz; **4.** zülm, əziyyət; **~ of poverty** ehtiyacın əziyyəti / zülmü; **~ of hunger** aclığın əziyyəti

**pinch**[2] [pɪntʃ] *v* **1.** çimdikləmək; əzmək; *The little girl was crying, because somebody had pinched her Balaca qız ağlayırdı çünki, kimsə onu çimdikləmişdi*; **to ~ *one's* finger in the door** barmağını qapının arasında qoyub əzmək; *I have pinched my finger in the door Mən barmağımı qapının arasında qoyub əzmişəm*; **2.** çimdik-çimdik götürmək; *He pinched the snuff-box empty by degrees Çimdik-çimdik götürərək o, burunotu qabını boşaltdı*; **3.** əzab / əziyyət vermək; **to be ~ed with cold / hunger** soyuqdan / aclıqdan əziyyət çəkmək; **4.** xəsislik etmək, qənaətlə işlətmək; **5.** azaltmaq, məhdudlaşdırmaq; **to ~ *smb.* in his food** bir kəsin yeməyini azaltmaq / məhdudlaşdırmaq; **to ~ oneself** özünə rəva bilməmək, özünü hər şeydən məhrum etmək; **6.** *id. d.d.* bərk sürmək, qovmaq (*atı*); **9.** *k.t.* başını vurmaq, budamaq (*bitkini*);

◊ *That's where the shoe pinches ≅ Deyirəm axı məsələ nədir*

**pinched** [pɪntʃt] *adj* **1.** əzilmiş; **~ finger** əzilmiş barmaq; **2.** sıxışdırılmış, sıxıntıya sa-

lınmış; kəsilmiş, azaldılmış; **3.** dar (*paltar haq.*); **4.** arıq, üzgün, üzülmüş (*aclıqdan*); **~ with hunger** aclıqdan üzülmüş

**pine**[1] [paın] *n* **1.** *bot.* şam, şam ağacı; **2.** şam taxtası / oduncağı

**pine**[2] [paın] *adj* **1.** şam, şam ağacı; **a ~ forest** şam / şam ağacı meşəsi; **2.** şam ağacından qayırılmış; **a ~ furniture** şam ağacından qayırılmış mebel

**pine**[3] [paın] *v* **1.** arıqlamaq, zəifləmək, ərimək, əldən düşmək; üzülmək, əzab / iztirab çəkmək; **to ~ with hunger** aclıqdan əzab / əziyyət çəkmək / üzülmək; **to ~ with grief** qəmdən / kədərdən üzülmək; **2.** şikayətlənmək, şikayət etmək, gileylənmək; **3. (for, after)** həsrət çəkmək, həsrətində olmaq; həsrətini çəkmək; *He was pining for home O, evin həsrətini çəkirdi*

**pineapple**[1] [ˈpaın,æpl] *n bot.* ananas; ananas (*meyvə*); **fresh ~** tər / təzə ananas

**pineapple**[2] [ˈpaın,æpl] *adj* ananas; **~ juice** ananas şirəsi

**pine-cone** [ˈpaınkoun] *n* şam ağacının qozası

**pine-wood** [ˈpaınwud] *n* şam meşəsi, şamlıq

**pinfold**[1] [ˈpınfould] *n k.t.* ağıl (*mal-qara üçün*); *k.t.* küz

**pinfold**[2] [ˈpınfould] *v* mal-qaranı ağılda saxlamaq

**ping**[1] [pıŋ] *n* **1.** vıyıltı (*güllə səsi*); **the ~ of rifle bullets** tüfəng güllələrinin vıyıltısı; **2.** vızıltı (*ağcaqanadın səsi*)

**ping**[2] [pıŋ] *v* vıyıldamaq; vızıldamaq (*külək, güllə və s.*); *The wind was pinging all night long Külək bütün gecəni vıyıldadı / vıyıldayırdı*

**ping-pong** [ˈpıŋpɔŋ] (*həm də* **table tennis**) *n* stolüstü tennis, pinq-ponq

**pin-head** [ˈpınhed] *n* **1.** sancağın başı; **2.** *məc.* çox balaca şey

**pin-headed** [ˈpınˈhedıd] *adj d.d.* gic, başıboş, beyinsiz, ağılsız, səfeh, axmaq

**pinion**[2] [ˈpınıən] *v* **1.** qanadını kəsmək / kəsib gödəltmək; **2.** bağlamaq (*əllərini*); *Both his arms were pinioned Onun əllərinin hər ikisi bağlanılmışdı*

**pinioned** [ˈpınjənd] *adj* qanadlı, qanadı olan

**pink**[1] [pıŋk] *n* I **1.** *bot.* qərənfil; **2. (the ~)** ən yüksək səviyyə; ən yüksək dərəcə, zirvə; **in the ~** *d.d.* əla vəziyyətdə, sapsağlam (*səhhət, sağlamlıq haq.*); **in the ~ of condition** ən yüksək / əla şəraitdə; **3.** çəhrayı rəng

**pink** [pıŋk] *n* II *zool.* cavan qızılbalıq

**pink**[2] [pıŋk] *adj* **1.** çəhrayı, qızılgül rəngli; **2.** qırmızı; *His face became pink Onun sifəti qızardı*

**pink**[3] [pıŋk] *v* I **1.** qızarmaq; *Her cheeks pinked Onun yanaqları qızardı*; **2.** çəhrayı rəngə boyanmaq

**pink** [pıŋk] *v* II **1.** dəlmək, deşmək, deşik-deşik etmək; yaralamaq, batırmaq (*ucu şiş silahla*); *He pinked his adversary in the arm O, düşmənini qolundan yaraladı*; **2.** deşiklə bəzəmək; dilik-dilik / dilim-dilim etmək; *The dress was pinked at the edges Paltarın ətəyi dilim-dilim idi*

**pink** [pıŋk] *v* III *tex.* tıqqıldamaq, detonasiya vermək, ahəngsiz işləmək (*mühərrik haq.*)

**pinkish** [ˈpıŋkıʃ] *adj* açıq-çəhrayı, çəhrayıtəhər

**pinkness** [ˈpıŋknıs] *n* **1.** çəhrayılıq; çəhrayı rəng; **2.** liberallıq, liberalizm

**pinny** [ˈpını] *n* = **pinafore**

**pin-point**[1] [ˈpınpɔınt] *n* **1.** sancağın ucu; **2.** cüzi, çox az;
◊ **to be on ~s** iynə üstündə oturmaq

**pin-point**[2] [ˈpınpɔınt] *v* **1.** dəqiq göstərmək, dəqiq təyin etmək; **to ~ military bases on the map** xəritədə hərbi bazaları dəqiq göstərmək; **2.** cəmləşdirmək; **to ~ one's attention upon *smb.* / *smth.*** diqqətini bir kəsə / şeyə cəmləşdirmək; **3.** *hərb.* hədəfin yerini müəyyən etmək

**pin-prick** [ˈpınprık] *n* **1.** sancaq batması; **2.** pərtlik, dilxorluq; peşmançılıq

**pin-stripe** [ˈpınstraıp] *n* nazik açıq zolaq (*parçada*)

**pinto** [ˈpıntou] *n* (*pl* **-es** [-ouz]) *amer.* ala at

**pin-up**[2] [ˈpınʌp] *adj* gözəl, qəşəng, göyçək, sevimli, cazibəli, cəzbedici; **a ~ girl** cazibəli / cəzbedici qız

**piny** [ˈpaını] *adj* **1.** şam; **~ smell** şam iyi; **2.** şamlı, şam bitən; **~ hills** şam bitən təpələr

**pioneer**[1] [,paıəˈnıəʳ] *n* **1.** pioner, ilk kəşf edən; **architectural ~s** memarlığın ilk pionerləri; **the ~ of Arctic travel** Arktikanı ilk kəşf edən; **2.** ilk mühacir, bir yerə köçüb yerləşən ilk adam; **the ~s of the West** Amerikanın qərbinə gələn ilk mühacirlər; **3.** pioner

**pioneer**[2] [,paıəˈnıəʳ] *adj* ilk, başlanğıc; pioner; **~ work** ilk / başlanğıc iş; **a ~ plan** ilk / başlanğıc plan; **~ settlers** ilk / birinci mühacirlər

**pioneer**[3] [,paıəˈnıəʳ] *v* **1.** ilk kəşf edən olmaq, pioner olmaq; **2.** aparmaq; istiqamətləndirmək, istiqamət vermək

**pious** [ˈpaıəs] *adj* **1.** dindar, mömin, zahid; **a ~ Muslim** dindar / mömin müsəlman; **2.** özünü dindar / mömin kimi aparan

**piously** [ˈpaıəslı] *adv* mömincəsinə, dindarcasına

**pip**[1] [pıp] *n* I meyvədə olan xırda çəyirdək; **apple / grape / orange ~s** alma / üzüm / portağal çəyirdəkləri

**pip** [pıp] *n* II **1.** (*adət.* **the ~**) dilçək xəstəliyi (*quşlarda*); **2.** *d.d.* pis ovqat / əhvaliruhiyyə, kefsizlik; **to have the ~** ürəyi sıxılmaq, xiffət etmək; **to give *smb.* the ~** bir kəsin ovqatını təlx etmək, bir kəsin kefini pozmaq

**pip** [pıp] *n* III **1.** xal (*kartda, dominoda*); **2.** *d.d.* ulduz (*poqonda*); **to be senior by one ~** bir ulduzu artıq olmaq, bir rütbə yuxarı olmaq

**pip**[2] [pıp] *v* (**-pp-**) I **1.** ciyildəmək, cikkildəmək, cibbildəmək; cik-cik etmək; **2.** çıxmaq (*yumurtadan*)

**pip** [pıp] *v* (**-pp-**) II **1.** vurmaq, yaralamaq; vurub yaralamaq (*güllə ilə*); **2.** qalib gəlmək, məğlub etmək; **3.** rədd etmək, səs verməmək (*seçkidə*); **4.** kəsmək, pis qiymət vermək (*imtahanda*); *He was pipped O kəsildi*; **5.** yararsız hesab etmək; *He was pipped for active service Onu həqiqi hərbi xidmətə yararsız hesab etdilər*

**pipage** [ˈpaıpıdʒ] *n* **1.** vurma, çəkib vurma (*nasosla bir yerdən başqa yerə*); boru kəməri ilə vurma; **2.** boru kəməri çəkmə

**pipe**[1] [paıp] *n* I **1.** boru; **to lay ~s** boru çəkmək; **2.** boru kəməri; **3.** qəlyan; **to smoke a ~** qəlyan çəkmək; **4.** sümsü, tütək, ney; **5.** *pl* volinka (*xalq musiqi aləti*); **6.** oxuma (*quş və s. haq.*); vıyıltı, vızıltı; **the thin ~ of gnats** ağcaqanadların zəif vızıltısı; **7.** səs; **to have a fine ~** yaxşı / gözəl / məlahətli səsi olmaq;
◊ **to set up *one's* ~s** qışqırmaq, bağırmaq, çığırmaq, fəryad / fəğan etmək; **to put *smb.'s* ~ out 1)** bir kəsə ziyan vurmaq, bir kəsin işini korlamaq; **2)** bir kəsi öldürmək / məhv etmək

**pipe** [paıp] *n* II çəllək (*şərab və ya yağ üçün*)

**pipe**[2] [paıp] *v* I **1.** sümsü / tütək / ney çalmaq; **to ~ a song** tütəkdə / neydə nəğmə çalmaq; **2.** sümsü ilə çağırmaq; **3.** vıyıldamaq (*külək, güllə haq.*); *The bullets were piping all around us Bütün ətrafımızda güllələr vıyıldayırdı*; **4.** oxumaq (*quş haq.*); **5.** ciyildəmək, cikkildəmək, cibbildəmək; **6.** *d.d.* qəlyan çəkmək; **7.** boru ilə təchiz etmək

**pipe**[1] [paıp] *v* II *bağç.* bicləri / kənar budaqları kəsmək / vurmaq

**pipedream** [ˈpaıpdri:m] *n* başagəlməz arzu, xam xəyal, xülya

**pipeline**[1] [ˈpaıplaın] *n* boru kəməri; **to lay a ~** boru kəməri çəkmək

**pipeline**[2] [ˈpaıplaın] *v* boru kəməri çəkmək

**piper** [ˈpaıpəʳ] *n* **1.** tuluq zurnası çalan; tütəkçalan, neyçalan, sümsüçalan; **2.** sürülüb əldən salınmış / sancılanmış at;
◊ *He who pays the piper calls the tune at. söz.* ≡ *Keçəl halva yeyər puluna minnət*

**pipette** [pıˈpet] *n* damcıtökən, pipet

**pipework** [ˈpaıpwə:k] *n* boruçəkmə işi

**piping**[1] [ˈpaıpıŋ] *n* **1.** sümsüdə / neydə / tütəkdə çalma; **2.** sümsü / ney / tütək səsi; **3.** kəskin / güclü / şiddətli / qulaqbatıran səs; **4.** ciyilti, civilti; **the ~ of mice** siçovulların ciyiltisi; **5.** quşun oxuması; **6.** boru kəməri; boru sistemi

**piping**[2] [ˈpaıpıŋ] *adj* **1.** tütəkdə çalan; **2.** kəskin, qulaqbatıran; ciyiltili; **a thin ~ voice** nazik ciyiltili səs

**pipy** [ˈpaıpı] *adj* **1.** boruşəkilli, boruyaoxşar; **2.** kəskin, qulaqbatırıcı; **a ~ voice** kəskin / qulaqbatırıcı səs; **3.** *d.d.* ağlağan; **a ~ child** ağlağan uşaq

**piquancy** [ˈpi:kənsı] *n* tündlük, kəskinlik

**piquant** [ˈpi:kənt] *adj* **1.** tünd, kəskin; **~ sauce** tünd sous; **2.** şirnikdirici, tamahsılandırıcı, həvəsləndirici; cazibəli, cəzbedici

**pique[1]** [pi:k] *n* pərtlik, dilxorçuluq; peşmançılıq; **feeling of ~** peşmançılıq hissi
**pique[2]** [pi:k] *v* **1.** sancmaq, acılamaq, toxunmaq, təhqir / pərt etmək; **2.** oyatmaq, doğurmaq; **to ~ *smb.'s* curiosity** bir kəsdə maraq oyatmaq
**piracy** [ˈpaɪərəsı] *n* **1.** piratlıq, dəniz quldurluğu; **2.** müəllif hüququnun pozulması
**pirate[1]** [ˈpaɪərıt] *n* **1.** pirat, dəniz quldurlu; **2.** müəlliflik hüququnu pozan
**pirate[2]** [ˈpaɪərıt] *v* **1.** piratlıq etmək; **2.** müəllif hüququnu pozmaq
**piss[1]** [pıs] *n* sidik; **to have a ~** siymək, işəmək; **to go for a ~** siyməyə / işəməyə getmək
**piss[2]** [pıs] *v* işəmək, siymək; **to ~ oneself (*laughing*)** işəyib özünü batırmaq (*gülməkdən*)
**pistol[1]** [ˈpıstl] *n* tapança; **to put a ~ to *one's* head** başına tapança sıxmaq
**pistol[2]** [ˈpıstl] *v* tapança atmaq
**pistol-shot** [ˈpıstlʃət] *n* tapança atəşi
**pit[1]** [pıt] *n* **1.** quyu; çala, çuxur; boşluq; **air ~** hava boşluğu; **to dig / to excavate a ~** quyu / çala qazmaq; **2.** *hərb.* biradamlıq səngər; **3.** şaxta, mədən; karxana; **4.** tərəvəz saxlamaq üçün quyu / çala; **5.** çopurluq, çopur yeri; **a few ~s of the smallpox** çiçək xəstəliyindən qalmış bir az çopurluq; **6.** orkestr üçün yer; **9.** xoruz döyüşdürmək üçün meydan;
◊ **to dig a ~ for *smb.*** bir kəsə quyu qazmaq
**pit[2]** [pıt] *v* (**-tt-**) I **1.** iz qoymaq / buraxmaq, səthdə xırda çuxurlar əmələ gətirmək; *Acid had pitted the surface of the silver Turşu gümüşün səthində xırda-xırda çuxurlar əmələ gətirmişdi;* **2.** saxlamaq üçün quyuya qoymaq (*xüs. tərəvəzi*); **to ~ potatoes** kartofu quyulamaq (*saxlamaq üçün*); **3.** iz buraxmaq, çopurlaşmaq; *Her face was pitted with smallpox Onun sifəti çiçək xəstəliyindən çopurlu idi;* **4.** (**against**) qızışdırmaq, salışdırmaq (*xoruzları*)
**pit** [pıt] *v* (**-tt-**) II çəyirdəkləri çıxartmaq; **to ~ cherries** albalıların çəyirdəyini çıxartmaq
**pitted** [ˈpıtıd] *adj* çəyirdəyi çıxarılmış; **~ peaches / cherries / apricots, *etc.*** çəyirdəyi çıxarılmış şaftalılar / albalılar / əriklər *və s.*
**pitch[1]** [pıtʃ] *n* I **1.** qatran; bişmiş qatran; zift; pek; **2.** bitum (*asfalt, qudron və s.*);
◊ **black / dark as ~** qatran kimi qara
**pitch** [pıtʃ] *n* II **1.** sıçrama; tullama; *It was a fine pitch Bu uğurlu sıçrayış / tullanma idi;* **2.** (*bir*) qucaq; **the ~ of hay** bir qucaq ot; **3.** bazara çıxarıla bilən bir partiya mal; **a ~ of cheese / of butter / of milk, *etc.*** bir partiya pendir / yağ / süd *və s.*; **4.** güc, səviyyə, intensivlik; **the ~ of light** işığın gücü / intensivliyi; **5.** daimi yeri olan (*küçə alverçisinin / natiqinin*); **6.** *id.* meydança; **football ~** futbol meydançası; **hockey ~** hokkey meydançası
**pitch[2]** [pıtʃ] *v* I qatranlamaq, qatran çəkmək / hopdurmaq
**pitch** [pıtʃ] *v* II **1.** tikmək, qurmaq; **to ~ a tent** çadır qurmaq; **2.** yerləşmək; *He invited us to pitch on a spot close to the village O bizə təklif etdi ki, biz kəndin yaxınlığında bir yerdə yerləşək;* **3.** qoymaq; dik qoymaq; **to ~ a ladder against a wall** nərdivanı divara (dik) qoymaq; **4.** atmaq, tullamaq, tolazlamaq; **to ~ hay** yaba ilə ot atmaq; **5.** satışa qoymaq; *A large consignment of goods was pitched yesterday Dünən satışa böyük partiya mal qoyuldu;* **6.** düşmək, dəymək;
◊ **to ~ *one's* tent** bir yerdə qərar tutmaq; **to ~ a party** *amer.* qonaqlıq düzəltmək
**pitch-black** [ˌpıtʃˈblæk] *adj* qatran kimi qara / qaranlıq; **a ~ night** qatran kimi qaranlıq / zülmət gecə
**pitch-dark** [ˌpıtʃˈda:k] *adj* tam / tamam / bərk qaranlıq; *It's pitch-dark outside Bayırda qatran kimi qaranlıqdır*
**pitcher** [ˈpıtʃəʳ] *n* I səhəng, bardaq;
◊ **~s have ears** ≅ *Divarın da qulağı var*
**pitcher** [ˈpıtʃəʳ] *n* II **1.** küçə alverçisi (*müəyyən bir yerdə mal satan*); **2.** bülöv daşı, çaydaşı (*yerə döşəmək üçün*); **3.** *d.d.* əyyaş
**pitchfork[1]** [ˈpıtʃɔ:k] *n* I ot yabası
**pitchfork** [ˈpıtʃfɔ:k] *n* II kamerton
**pitchfork[2]** [ˈpıtʃfɔ:k] *v* **1.** yaba ilə vermək / atmaq / yığmaq (*otu*); **2.** *məc.* gözlənilmədən yüksək vəzifəyə təyin etmək





**pitchy** [ˈpıtʃı] *adj* **1.** qatranlı; qatranlanmış, qatran hopdurulmuş; **2.** qatran kimi qara; **the ~ night** qatran kimi qaranlıq gecə
**piteous** [ˈpıtıəs] *adj* yazıq; zavallı, zəlil; **a ~ state** zavallı / zəlil vəziyyət; **a ~ cry** zavallı qışqırıq; *The dog in the empty house gave a piteous cry Boş otaqdakı it yalvarıcı bir səs çıxartdı*
**piteously** [ˈpıtıəslı] *adv* yazıq-yazıq, zavallı-zavallı
**piteousness** [ˈpıtıəsnıs] *n* yazıqlıq, zavallılıq, zəlillik
**pitfall** [ˈpıtfɔ:l] *n* **1.** tələ, tor; hiylə, kələk; **2.** səhv, xata; *The article avoids the usual pitfalls Bu məqalədə adi səhvlər yoxdur*
**pith** [pıθ] *n* **1.** lət, meyvənin əti; **2.** *bot.* özək (*bitkidə*); **3.** *anat.* onurğa beyni, haram ilik; **4.** mahiyyət, məğz, əsas mətləb; **to get the ~ (and marrow) out of a book** kitabın əsl mahiyyətini anlamaq / başa düşmək
**pithily** [ˈpıθılı] *adv* mətləbdən, mahiyyətdən; **to speak / to write ~** mətləbdən danışmaq / yazmaq
**pithless** [ˈpıθlıs] *adj* **1.** zəif, gücsüz, qüvvəsiz, cansız; **2.** *bot.* özəksiz, özəyi olmayan
**pithy** [ˈpıθı] *adj* **1.** *bot.* özəkli, özəyi olan; **2.** yığcam, müxtəsər (*üslub haq.*); lakonik; **a plain / a short ~ lecture** sadə / lakonik mühazirə; **3.** mənalı, ifadəli
**pitiable** [ˈpıtıəbl] *adj* **1.** acınacaqlı, zavallı, zəlil; **~ condition** zavallı / acınacaqlı vəziyyət; **2.** az, cüzi; **~ minority** cüzi azlıq
**pitiful** [ˈpıtıfl] *adj* **1.** mərhəmətli, rəhmli, rəhmdil, ürəyiyumşaq, yumşaqürəkli; **to be ~ to *smb.*** bir kəsə qarşı rəhmli / mərhəmətli olmaq; **2.** qəmli, kədərli, acınacaqlı; **~ sight** kədərli / qəmli / acınacaqlı mənzərə; **3.** dəyərsiz, yararsız; **a copy of ~ verses** yararsız / dəyərsiz şerlər
**pitifully** [ˈpıtıfəlı] *adv* qəmli-qəmli, kədərli-kədərli
**pitifulness** [ˈpıtıflnıs] *n* qəmlilik, kədərlilik
**pitiless** [ˈpıtılıs] *adj* amansız, rəhmsiz, zalım, qəddar; **a ~ killer** amansız / qəddar qatil; **a ~ tyrant** qəddar / zalım müstəbid
**pitman** [ˈpıtmən] *n* (*pl* **-men** [-mən]) şaxtaçı, kömürçıxaran, qazmaçı (*fəhlə*)
**pittance** [ˈpıtns] *n* **1.** qəpik-quruş; **to earn a scanty ~** qəpik-quruş qazanmaq; **to work all day for a ~** bütün günü qəpik-quruşa işləmək; **2.** çox az, cüzi, az / cüzi miqdar
**pitter-patter[1]** [ˈpıtəpætəʳ] *n* yüngül tıqqıltı / tappıltı; **the soft ~ of the rain on the roof** yağışın damda yüngül tıqqıltısı / tapıltısı
**pitter-patter[2]** [ˈpıtəpætəʳ] *adv* döyünə-döyünə, titrəyə-titrəyə, əsə-əsə
**pity[1]** [ˈpıtı] *n* **1.** rəhm, şəfqət, ürəyi / canı yanma, acıma; **to have / to take ~ on / upon *smb.*** bir kəsə canı / ürəyi yanmaq; *Have pity on us Bizə yazığın / yazığınız gəlsin!* **to feel ~ for *smb.*** bir kəsə rəhmi / yazığı gəlmək; **to excite ~** rəhm / şəfqət / mərhəmət oyatmaq; **2.**: *It's a pity! Heyf! Heyf (ki), Təəssüf (ki), Əfsus (ki); It's a thousand pities d.d. Çox təəssüf (ki), Çox heyf (ki), Çox əfsus (ki); What a pity! Çox heyf! Çox əfsus! Çox təəssüf!*
**pity[2]** [ˈpıtı] *v* **1.** yazığı / rəhmi gəlmək; halına acımaq; **to take ~ on *smb.*** bir kəsə yazığı gəlmək; *I took pity on the beggar and gave him some money Mənim dilənçiyə yazığım gəldi və ona bir az pul verdim;* **2.** təəssüf etmək, peşman olmaq
**pivot[1]** [ˈpıvət] *n* **1.** dayaq nöqtəsi; **2.** əsas nöqtə, mərkəz; **the ~ of economic life** iqtisadi həyatın əsası
**pivot[2]** [ˈpıvət] *v* fırlanmaq, hərlənmək; dolanmaq; **to ~ on *one's* heels** dabanları üstündə fırlanmaq
**pivotal** [ˈpıvətl] *adj* **1.** mərkəzi, mərkəzdə olan; **2.** əsas, başlıca, ən mühüm; həlledici; **~ fact** əsas fakt / sübut
**placard[1]** [ˈplæka:d] *n* elan; plakat; **to hang a ~** elan / plakat asmaq
**placard[2]** [ˈplæka:d] *v* **1.** elan asmaq / vurmaq; *Bills were placarded on the walls Elanlar divarlara vurulmuşdu;* **2.** satış üçün elandan istifadə etmək; **to ~ a sale** satış haqqında elan vermək
**placate** [pləˈkeıt] *v* sakitləşdirmək, sakit / təskin etmək
**placatory** [ˈplækətrı] *adj* sakitləşdirici, sakit edən
**place[1]** [pleıs] *n* **1.** yer, məkan; **a wet ~ on the floor** döşəmədə nəm / yaş yer; **to move from ~ to ~** bir yerdən başqa yerə getmək; **to come to a ~** bir yerə gəlmək; **holy ~s** müqəddəs yerlər; *Show me the*

*vaşca*); **to ~ at the door** qapını (yavaşca) döymək; **to ~ *smb.* on the shoulder** bir kəsin çiyninə astaca vurmaq
**tap-dance** [ˈtæpda:ns] *n* çeçyotka (*rus xalq rəqsi*)
**tape[1]** [teɪp] *n* **1.** şərid, lent; **adhesive ~** izolyasiya lenti; **magnetic ~** maqnit lenti; **to play back a ~** maqnitofon yazısına dübarə qulaq asmaq; **2.** teleqraf lenti; **3.** *id.* finiş xətti; **to breast the ~** finişə çatmaq; **4.** *tib.* plastır; məlhəm; **sticky ~** skotç, yapışqan lent
**tape[2]** [teɪp] *v* **1.** bağlamaq, sarımaq, bənd etmək (*qaytanla, lentlə*); **2.** ölçmək (*ruletka ilə*); **to ~ up** bintlə sarımaq; **3.** maqnit lentinə yazmaq
**tape-line** [ˈteɪplaɪn] *n* ruletka (*ölçü lenti*)
**tape-machine** [ˈteɪpmə,ʃi:n] *n* hərf çap edən teleqraf aparatı
**tape-measure** [ˈteɪp,meʒəʳ] *n* = **tape-line**
**taper[1]** [ˈteɪpəʳ] *n* **1.** nazik şam; **2.** zəif işıq; **3.** konus, konus forması; **4.** tədricən zəifləmə
**taper[2]** [ˈteɪpəʳ] *v* **1.** daralmaq; *One end tapers Bir tərəf / uc daralır*; **2. (off)** itiləmək; naziklәşdirmək; sivriləşdirmək
**tape-record** [ˈteɪprɪ,kɔ:d] *v* maqnitofona yazmaq
**tape-recorder** [ˈteɪprɪ,kɔ:dəʳ] *n* maqnitofon
**tapering** [ˈteɪpərɪŋ] *adj* **1.** itilənmiş, naziklәşdirilmiş; daralmış; **2.** nazik və uzun (*barmaqlar, əl və s. haq.*)
**tapestry** [ˈtæpɪstrɪ] *n* **1.** qobelen, divar xalçası; **2.** qobelenəoxşar bəzəkli parça
**tapeworm** [ˈteɪpwə:m] *n tib.* qurd
**taphouse** [ˈtæphaus] *n* pivəxana; bar
**tapper** [ˈtæpəʳ] *n* teleqraf açarı
**tappet** [ˈtæpɪt] *n tex.* qapaqaçan
**taproom** [ˈtæpru:m] *n* = **taphouse**
**tapster** [ˈtæpstəʳ] *n* bufetçi
**tar[1]** [ta:] *n* qatran; qudron; zift
**tar[2]** [ta:] *adj* qatran; **a ~ barrel** qatran çəlləyi
**tar[3]** [ta:] *v* qatranlamaq; qudronlamaq
**taradiddle** [ˈtærədɪdl] *n d.d.* yalan, uydurma
**tarantella** [,tærənˈtelə] *n mus.* tarantella
**tarantula** [təˈræntjulə] *n zool.* böyə, böv
**taraxacum** [təˈræksəkəm] *n bot.* zəncirotu
**tarboosh** [ˈta:bu:ʃ] *n* fəs, təsək (*baş örtüyü*)
**tardy** [ˈta:dɪ] *adj* **1.** yavaş, tədrici, ləng; **~ progress** tədrici tərəqqi; **2.** *amer.* gecikmiş, ləngimiş; gec; **to be ~ for school** dərsə gecikmək
**tare** [teəʳ] *n bot.* **1.** çölnoxudu; **2.** tara (*qabın, arabanın, maşının və s.*); taranın çəkisi
**target** [ˈta:gɪt] *n* **1.** məqsəd, niyyət; **2.** hədəf, nişan; **off the ~** hədəfdən yan; **to hit the ~** nişana dəymək, hədəfə vurmaq / düşmək
**target practice** [ˈta:gɪtˈpræktɪs] *n* təlim / məşq atışı
**tariff[1]** [ˈtærɪf] *n* **1.** tarif (*vergi, maaş və s. cədvəli*); **preferential ~** preferensial gömrük tarifi; **2.** qiymətləndirmə; qiymət qoyulma; **to terminate all ~ preferences** bütün tarif güzəştlərini ləğv etmək
**tariff[2]** [ˈtærɪf] *adj* tarif; **~ reform** tarif islahatı
**tariff[3]** [ˈtærɪf] *v* **1.** tarifə daxil etmək; **2.** qiymətləndirmək, qiymət müəyyən etmək
**tarnish[1]** [ˈta:nɪʃ] *n* **1.** tutqunluq, qeyri-şəffaflıq; **2.** *məc.* ləkə; xal
**tarnish[2]** [ˈta:nɪʃ] *v* **1.** parıltısını itirmək; *The damp has tarnished the silver Nəm gümüşün parıltısını itirib*; **2.** *məc.* ləkələmək, korlamaq; *His reputation is tarnished Onun şöhrəti ləkəlidir*
**tar paper** [ˈta:,peɪpəʳ] *n tik.* tol
**tarpaulin** [ta:ˈpɔ:lɪn] *n* **1.** brezent; **to cover the goods on the lorry with a ~** yük maşınındakı malların üstünü brezentlə örtmək; **to spread a ~** brezent çəkmək; **2.** matros kepkası
**tarragon** [ˈtærəgən] *n bot.* **1.** yovşan; **2.** tərxun
**tarry[1]** [ˈta:rɪ] *adj* qatranlı; qatran sürtülmüş
**tarry[2]** [ˈtærɪ] *v* **1.** yubanmaq; **to ~ a few days at / in a place** bir yerdə bir neçə gün yubanmaq; **2. (for)** *amer.* gözləmək, gözləyib məqsədə çatmaq; **to ~ long** çox gözləmək
**tart[1]** [ta:t] *n* **1.** piroq; ev tortu; **apple ~** alma piroqu; **2.** meyvə pirojnası; **3.** *d.d.* yüngülxasiyyət qadın
**tart[2]** [ta:t] *adj* **1.** turş; turşumuş; ağızbüzən; **~ fruit** ağızbüzən meyvə **2.** *məc.* kəskin, tünd (*cavab, etiraz və s. haq.*); **~ humour** kəskin yumor
**tartan** [ˈta:tn] *n* **1.** şotlandka, dama-dama parça; **2.** dama-dama şal





**Tartar[1]** [ˈta:təʳ] *n* **1.** tatar; **the ~s** tatarlar; **2.** tatar dili
**Tartar[2]** [ˈta:təʳ] *adj* tatar; **the ~ language** tatar dili
**task[1]** [ta:sk] *n* **1.** tapşırıq; məsələ; **to set a ~ before *smb.*** bir kəsə tapşırıq vermək, **major ~** əsas tapşırıq; **2.** *amer.* norma (*işçinin*)
**task[2]** [ta:sk] *v* **1.** tapşırıq vermək; **2.** zəhmət vermək; çətinə salmaq; *It tasks my power Buna mənim gücüm çatmaz*
**taskmaster** [ˈta:sk,ma:stəʳ] *n* **1.** nəzarətçi, gözətçi; **2.** briqadir
**tassel** [ˈtæsəl] *n* **1.** fırça, tük qələm; **2.** əlfəcin, nişan (*kitabın arasına qoymaq üçün*)
**taste[1]** [teɪst] *n* **1.** dad, tam; ləzzət; *Sugar has a sweet taste Qəndin şirin tamı var*; **to leave a bad ~ in the mouth** ağızda pis tam qoymaq; **to take / to have a ~ of…** …dadına baxmaq; **2. (for)** xoşlama, meyli olma; *He has a taste for French cigarettes O, fransız siqaretlərini xoşlayır*; **to have a ~ for music** musiqiyə meyli olmaq; **3.** zövq; **to dress in good / bad ~** zövqlə / zövqsüz geyinmək; *Tastes differ Zövqlər müxtəlif olur*
**taste[2]** [teɪst] *v* **1.** taminə / dadına baxmaq; yoxlamaq, sınamaq; **to ~ the soup** şorbanın dadına baxmaq; **2.** dadı duymaq / hiss etmək; *Do you taste the garlic? Sən / Siz sarımsaq dadını hiss edirsənmi / edirsinizmi?*; **3.** dadı / tamı olmaq; *It tastes sour Bu, turş dadır;* **4.** *məc.* dadını hiss etmək / bilmək; **to ~ power** hakimiyyətin dadını bilmək
**tasteful** [ˈteɪstful] *adj* **1.** zövqlü; **2.** dadlı, ləzzətli
**tastefully** [ˈteɪstfulɪ] *adv* zövqlə; **to dress ~** zövqlə geyinmək
**tasteless** [ˈteɪstlɪs] *adj* **1.** dadsız; şit; **2.** zövqsüz; **3.** nəzakətsiz; **4.** bayağı
**taster** [ˈteɪstəʳ] *n* dequstator, dequstasiya mütəxəssisi; **a wine ~** çaxır dequstatoru
**tasty** [ˈteɪstɪ] *adj* **1.** dadlı, ləzzətli; **2.** *məc.* zövqlü, xoş, xoşagələn
**tatter[1]** [ˈtætəʳ] *n* **1.** *pl* cındır paltar; cır-cındır; **to tear to ~** cırıq-cırıq etmək; dağıtmaq; **2.** *məc.* alt-üst etmək; **to tear *smb.*'s reputation to ~** bir kəsin şöhrətini heçə endirmək
**tatter[2]** [ˈtætəʳ] *v* **1.** cır-cındıra çevrilmək; **2.** cırılıb parça-parça olmaq
**tatterdemalion** [,tætədəˈmeɪljən] *n* cındır paltar; səfil, dilənçi (*adam*)
**tattered** [ˈtætəd] *adj* cındır, cırıq-cırıq; dağılmış (*paltar haq.*); didilib tökülmüş
**tattle[1]** [ˈtætl] *n* cəfəngiyyat, boş söhbət; qeybət
**tattle[2]** [ˈtætl] *v* **1.** boşboğazlıq etmək, çərənləmək; qeybət etmək; **2. (on)** çuğulluq etmək, çuğullamaq
**tattler** [ˈtætləʳ] *n* **1.** boşboğaz; qeybətçi (*adam*); **2.** xəbərçi, çuğulçu
**tattoo[1]** [təˈtu:] *n* **1.** təbil; təbil səsi / vaxtı; **to beat / to sound the ~** təbil çalmaq; **2.** *hərb.* axşam yoxlanışı siqnalı; **3.** tatuirovka
**tattoo[2]** [təˈtu:] *v* **1.** təbil çalmaq; **2.** döyəcləmək (*ayağı yerə*); taqqıldatmaq (*barmaqlarla*); **3.** tatuirovka etmək
**taunt[1]** [tɔ:nt] *n* istehza, ələ salma, rişxənd; **to hurl a ~ at *smb.*** bir kəsi ələ salmaq; **to endure the ~s of a successful rival** qalib gələn rəqibin istehzalarına dözmək
**taunt[2]** [tɔ:nt] *adj dən.* çox yüksək
**taunt[3]** [tɔ:nt] *v* ələ salmaq, istehza / rişxənd etmək
**tauromachy** [tɔ:ˈrɔməkɪ] *n* öküz döyüşü
**Taurus** [ˈtɔ:rəs] *n* Buğa bürcü
**taut** [tɔ:t] *adj* tarım, tarım çəkilmiş; gərgin; **~ nerves** tarıma çəkilmiş əsəblər
**tauten** [ˈtɔ:tn] *v* **1.** dartılmaq, gərilmək, tarımlaşmaq; **2.** dartmaq, gərmək
**tautly** [ˈtɔ:tlɪ] *adv* tarım, bərk; gərgin
**tautological** [,tɔ:təˈlɔdʒɪkl] *adj* tavtologiya
**tautology** [tɔ:ˈtɔlədʒɪ] *n* tavtologiya
**tavern** [ˈtævn] *n* pivəxana; yeməkxana
**tawdry[1]** [ˈtɔ:drɪ] *n* zövqsüz bəzək-düzək; zahiri bəzək
**tawdry[2]** [ˈtɔ:drɪ] *adj* zahiri, saxta
**tawny** [ˈtɔ:nɪ] *adj* açıq-şabalıdı, sarı-qəhvəyi
**tawny owl** [ˈtɔ:nɪaul] *n zool.* kor yapalaq
**tax[1]** [tæks] *n* **1.** vergi; **2.** gərginlik; ağır yük
**tax[2]** [tæks] *adj* vergi; **~ system** vergi sistemi; **~ revenues** vergi gəlirləri
**tax[3]** [tæks] *v* **1.** vergi qoymaq; **2.** həddindən artıq gərmək; güc vermək; *I cannot tax my memory Yadıma sala bilmirəm*; **3.** sınamaq, yoxlamaq; **to ~ *smb.*'s patience /**

**strength** bir kəsin səbrini / gücünü sınamaq; **4.** günahlandırmaq, suçlamaq; **to ~ *smb.* with a crime** bir kəsi cinayət törətməkdə günahlandırmaq; **5.** *hüq.* ölçüsünü / həcmini müəyyən etmək (*itkilərin, cərimələrin, xərclərin və s.*)
**taxable** ['tæksəbl] *adj* vergi qoyulan, vergi alınan, vergiyə düşən
**taxation** [tæk'seıʃn] *n* **1.** vergi, vergi qoyma / qoyulma; **2.** verginin həcmi / miqdarı; **to grumble at high / heavy ~** verginin yüksək olmasından şikayətlənmək; **to reduce ~** vergini azaltmaq
**tax collector** ['tæksə,lektə$^r$] *n* vergi toplayan, vergi yığan (*şəxs*)
**tax evasion** ['tæksı'veıʒn] *n* vergidən yayınma
**tax-exempt** ['tæksıg'zempt] *adj* vergilərdən / vergi ödənişindən azad olunan
**tax-free** ['tæks'fri:] *adj* vergisiz; vergilərdən azad olunmuş
**taxi**[1] ['tæksı] *n* taksi; **to hire / to take a ~** taksi tutmaq
**taxi**[2] ['tæksı] *v* **1.** taksi ilə getmək; taksidə getmək; **2.** *av.* sükanı çevirmək; yerdə sürmək (*təyyarəni*); **to ~ up to** yerlə sürüb gətirmək (*təyyarəni*)
**taxicab** ['tæksıkæb] *n* = **taxi**[1]
**taxi-dancer** ['tæksı,da:nsə$^r$] *n amer.* peşəkar tərəfmüqabil (*rəqs etmək üzrə*)
**taxidermist** ['tæksıdə:mıst] *n* müqəvva dolduran adam
**taxidermy** ['tæksıdə:mı] *n* müqəvva doldurma
**taxi-driver** ['tæksı,draıvə$^r$] *n* taksi sürücüsü
**taxi-man** ['tæksımən] *n* = **taxi-driver**
**taximeter** ['tæksı,mi:tə$^r$] *n* taksometr, sayğac
**taxi rank** ['tæksı,ræŋk] *n* taksi dayanacağı
**taxonomy** [tæk'sɔnəmı] *n* taksonomiya, təsnifat
**taxpayer** ['tækspeıə$^r$] *n* vergi ödəyicisi / verən
**tea** [ti:] *n* çay; **strong / weak ~** tünd / açıq çay; **to make / to brew ~** çay dəmləmək
**tea bag** ['ti:bæg] *n* çay paketi; birdəfəlik çay
**tea break** ['ti:breık] *n* çay fasiləsi
**tea caddy** ['ti:kædı] *n* çayqabı, çayriz
**tea pot** ['ti:pɔt] *n* çaydan
**tea time** ['ti:taım] *n* çay vaxtı (*günorta*)
**tea towel** ['ti:tauəl] *n* çay dəsmalı
**tea-tray** ['ti:treı] *n* çay podnosu; sini; məcməyi
**teach** [ti:ʃ] *v* **1.** dərs demək / vermək; **to ~ English / Russian** ingilis / rus dili dərsi demək; **2.** öyrətmək; **to ~ someone English** bir kəsə ingilis dili öyrətmək; **3.** təlim etmək, öyrətmək; *History teaches that… Tarix öyrədir ki,…;* **4.** *məc.* tənbeh etmək, dərsini vermək; *That will teach him! Bu ona dərs olar!*
**teacher** ['ti:ʃə$^r$] *n* müəllim, müəllimə
**teaching**[1] ['ti:ʃıŋ] *n* **1.** dərs vermə; tədris; **2.** öyrətmə; öyrənmə; **3.** nəzəriyyə, doktrina
**teaching**[2] ['ti:ʃıŋ] *adj* müəllim, müəllimlik; **the ~ profession** müəllim / müəllimlik sənəti; **the ~ staff** müəllim heyəti; **~ load** tədris yükü; **~ experience** müəllimlik təcrübəsi
**teaching**[3] ['ti:ʃıŋ] **to teach** *felinin pr.p forması*
**teacup** ['ti:kʌp] *n* çay fincanı
**tea dealer** ['ti:,di:lə$^r$] *n* çay alverçisi / tacirətçisi
**teahouse** ['ti:haus] *n* çay evi, çayxana
**tea leaf** ['ti:li:f] *n* çay yarpağı
**team**[1] [ti:m] *n* **1.** qoşqu; **2.** briqada; işçi qrupu; **3.** *id.* komanda; **4.** gəmi heyəti
**team**[2] [ti:m] *adj* komanda; **~ championship** komanda birinciliyi; **~ sports** komanda idman növü
**team**[3] [ti:m] *v* **1.** birləşmək; **2.** əməkdaşlıq etmək; **3.** qoşmaq (*atı və s.*)
**team-mate** ['ti:mmeıt] *n* **1.** komanda yoldaşı; **2.** eyni briqadanın / eyni dəstənin üzvü
**teamster** ['ti:mstə$^r$] *n* **1.** sürücü; arabaçı; **2.** *amer.* yük maşını sürücüsü
**team-work** ['ti:mwə:k] *n* **1.** briqada işi; **2.** əməkdaşlıq; **3.** qarşılıqlı kömək; **4.** *id.* uyğunluq; müntəzəmlik (*oyunçular arasında*)
**tear**[1] [tıə$^r$] *n* I **1.** göz yaşı; **in ~s** göz yaşları içərisində; **to burst into ~s** ağlamaq; **~s of joy** sevinc yaşları; **with ~s in his / her eyes** gözləri yaşlı; **to reduce *smb.* to ~s** bir kəsi ağlatmaq; **2.** damcı (*şeh*)





**tear** [tıə$^r$] *n* II **1.** kəsilmə, qırılma; **2.** deşik, dəlik; **3.** sürətli hərəkət; **full ~** çox cəld / tələsik
**tear**[2] [tıə$^r$] *v* **1.** cırmaq, yırtmaq; **to ~ *one's* stocking** corabını yırtmaq; **to ~ *one's* dress on a nail** paltarını mismara ilişdirib cırmaq; **to ~ a sheet of paper in two** bir vərəq kağızı iki yerə bölmək / cırmaq; **2.** yaralamaq; sıyırmaq; **3.** *məc.* parçalamaq; ağrıtmaq; **to be torn between** iki yerə bölünmək; **4.** ayrılmaq, tərk etmək; *She could scarcely tear herself away from the scene O, mənzərədən çox çətinliklə ayrıldı;* **5.** *məc.* yolmaq; *She tore her hair with rage O, qəzəbdən / hirsindən saçını yoldu;* **6.** cırılmaq, dağılmaq; **to ~ along / down** sürətlə getmək, şütümək, çapmaq; **to ~ down / off** qopartmaq; sökmək; **to ~ down posters** plakatları qopartmaq; **to ~ down a building** binanı sökmək; **to ~ out** cırmaq
**tear-drop** ['tıədrɔp] *n* göz yaşı
**tear-duct** ['tıədʌkt] *n anat.* göz yaşı kanalı
**tearful** ['tıəful] *adj* **1.** gözüyaşlı; **2.** qəmli; **~ farewell** qəmli ayrılıq
**tear-gas** ['tıəgəs] *n* gözyaşardıcı qaz
**tear-off** ['tıərɔf] *adj* cırılan, qopardılan; **a ~ calendar** cırılan təqvim
**tea-room** ['ti:rum] *n* çayxana
**tea-rose** ['ti:rouz] *n* çaygülü
**tear-sheet** ['tıəʃi:t] *n amer.* elan
**tear-shell** ['tıə'ʃel] *n hərb.* gözyaşardıcı qazı olan mərmi
**tear-stained** ['tıəsteınd] *adj* gözüyaşlı, ağlamaqdan gözləri qızarmış
**tease**[1] [ti:z] *n* **1.** öcəşkən / dalaşqan adam; **2.** sataşmaq cəhdi
**tease**[2] [ti:z] *v* **1.** sataşmaq; acıqlandırmaq; **to ~ someone about his being short** bir kəsə balacaboy olduğuna görə sataşmaq; **2.** təngə gətirmək, bezdirmək
**teasel** ['ti:zl] *v toxuc.* xovlamaq, xov vermək
**teaseler** ['ti:zlə$^r$] *n* xovlayıcı fəhlə
**tea-service** ['ti:,sə:vıs] *n* çay servizi
**tea-set** ['ti:set] *n* = **tea-service**
**tea-spoon** ['ti:spu:n] *n* çay qaşığı
**tea-strainer** ['ti:,streınə$^r$] *n* çay süzgəci
**teat** [ti:t] *n* **1.** məmə, döş giləsi; **2.** *tex.* tağalaq
**tea-table** ['ti:,teıbl] *n* çay stolu
**tea-urn** ['ti:ə:n] *n* su qaynadan cihaz; samovar
**technical** ['teknıkəl] *adj* texniki; sənaye; **~ school** texniki məktəb; **~ terms** texniki terminlər; **due to a ~ hitch / fault** texniki səbəblərə / qüsurlara görə; **a ~ difficulty** texniki çətinlik
**technicality** [,teknı'kælıtı] *n* **1.** texniki təfsilat; **2.** rəsmiyyət
**technician** [tek'nıʃən] *n* texnik
**technics** ['teknıks] *n* texniki elmlər
**technique** [tek'ni:k] *n* **1.** yol, üsul; **2.** texniki vərdiş / qabiliyyət
**technological** [,teknə'lɔdʒıkəl] *adj* texnoloji; texnologiya
**technologist** [tek'nɔlədʒıst] *n* texnoloq
**technology** [tek'nɔlədʒı] *n* **1.** texnologiya; texnika; **2.** xüsusi terminologiya; **the ~ of computers** kompyuter terminologiyası
**tectonic** [tek'tɔnık] *adj* **1.** arxitektura, memarlıq; **2.** *geol.* tektonik
**tedious** ['ti:djəs] *adj* darıxdırıcı; yorucu
**tedium** ['ti:djəm] *n* sıxıntı, üzüntü
**tee** [ti:] *n* hədəf, nişan (*oyunda*); **to a ~** lap dəqiq
**teem** [ti:m] *v* (**with**) vızıldaşmaq, qaynamaq; dolu olmaq; *The lakeside teemed with gnats and mosquitoes Gölün ətrafında mığmığalar və ağcaqanadlar vızıldaşırdı; His head is teeming with bright ideas Onun beyni parlaq ideyalarla doludur*
**teenage** ['ti:neıdʒ] *adj* yeniyetmələik, yeniyetmə; **a ~ son** yeniyetmə oğul
**teenager** ['ti:n,eıdʒə$^r$] *n* yeniyetmə (*13-19 yaş arasında oğlan və ya qız*)
**teener** ['ti:nə$^r$] *n* = **teenager**
**teeny** ['ti:nı] *adj d.d.* bambalaca, kiçicik
**teeter**[1] ['ti:tə$^r$] *n amer.* uşaq yelləncəyi
**teeter**[2] ['ti:tə$^r$] *v* **1.** yellənmək; **2.** *məc.* tərəddüd etmək
**teeth** [ti:θ] *n* **tooth** *isminin cəm forması*
**teethe** [ti:ð] *v* çıxmaq (*diş*)
**teethridge** ['ti:θrıdʒ] *n* alveollar, diş yuvaları
**teetotal** [ti:'toutl] *adj* ayıq, içki içməyən
**teetotaller** [ti:'toutlə$^r$] *n* içki içməyən adam
**telautogram** [te'lɔ:təgræm] *n* fototeleqram
**telautograph** [te'lɔ:təgra:f] *n* fototeleqraf

**telecast**[1] ['telıka:st] *n* televiziya verilişi
**telecast**[2] ['telıka:st] *v* televiziya verilişi vermək; teleproqram vermək
**telecommunication** ['telıkə,mju:nı'keıʃn] *n* telerabitə; uzaq rabitə
**telefilm** ['telıfılm] *n* telefilm, televiziya filmi
**telegenic** [,telı'dʒenık] *adj* telegenik
**telegram** ['telıgræm] *n* teleqram
**telegraph**[1] ['telıgra:f] *n* teleqraf
**telegraph**[2] ['telıgra:f] *v* teleqrafla xəbər göndərmək
**telegrapher** [tı'legrəfəʳ] *n* = **telegraphist**
**telegraphic** [,telı'græfık] *adj* teleqraf; ~ **address** teleqraf ünvanı, qısaldılmış ünvan
**telegraphist** [tı'legrəfıst] *n* teleqrafçı
**telegraph-line** ['telıgra:flaın] *n* teleqraf xətti
**telegraph-pole** ['telıgra:fpoul] *n* teleqraf dirəyi
**telegraphy** [tı'legrəfı] *n* teleqrafiya
**telemechanics** [,telımı'kænıks] *n pl* telemexanika
**telemeter** ['telımi:təʳ] *n* məsafəölçən (*aparat*)
**telepathy** [tı'lepəθı] *n* telepatiya
**telephone**[1] ['telıfoun] *n* telefon
**telephone**[2] ['telıfoun] *v* zəng / telefon etmək; **to ~ news to *smb*.** telefonla bir kəsə xəbər vermək
**telephone set** ['telıfoun'set] *n* telefon aparatı
**telephonic** [,telı'fɔnık] *adj* telefon; ~ **station** telefon stansiyası; ~ **bill** telefon qəbzi (*ödəniş üçün*)
**telephonist** [tı'lefənıst] *n* telefonçu, telefonist
**telephony** [tı'lefənı] *n* telefoniya
**telephotography** ['telıfə'tɔgrəfı] *n* telefotoqrafiya
**telescope** ['telıskoup] *n* teleskop
**teletype** ['telı'taıp] *n* teletayp
**teleview** ['telıvju:] *v* televiziya verilişinə baxmaq
**televiewer** ['telıvju:əʳ] *n* televiziya tamaşaçısı
**televise** ['telıvaız] *v* televiziya ilə göstərmək; **to ~ the Olympic Games** olimpiya oyunlarını televiziya ilə göstərmək
**television** ['telıvıʒn] *v* televiziya
**television set** ['telıvıʒən'set] *n* televizor, televiziya cihazı
**tell** [tel] *v* **1.** demək, söyləmək; danışmaq; **to ~ the truth** doğru danışmaq, həqiqəti söyləmək; **to ~ a lie** yalan danışmaq; **2.** göstərmək; **to ~ the time** vaxtı göstərmək (*saat haq.*); **3.** xəbər vermək (*sirri*); **4.** əmr etmək; buyurmaq, hökm etmək; *Tell the driver to wait for me De / Deyin, qoy sürücü məni gözləsin;* **5.** fərqləndirmək; **to ~ one from the other** birini o birindən fərqləndirmək; **6.** bilmək, başı çıxmaq, xəbəri olmaq; *How do you tell which of these buttons to press? Hardan bilərsən ki, bu düymələrin hansını basmaq lazımdır?* **7.** *d.d.* danlamaq; töhmətləndirmək; **8.** qərara gəlmək; demək; bilmək; **9.** təsir etmək, özünü göstərmək; *The years are beginning to tell İllər öz təsirini göstərməyə başlayır;* **10.** *d.d.* çuğulluq / xəbərçilik etmək; *You promised you wouldn't tell on me Söz verdin / verdiniz ki, məndən xəbərçilik etməyəcəksən / etməyəcəksiniz*
**tellable** ['teləbl] *adj* **1.** danışılası, deyiləsi; **2.** danışılmağa / danışmağa dəyən
**teller** ['teləʳ] *n* **1.** hekayəçi, nağılçı; **2.** səsləri hesablayan (*parlamentdə, məclisdə və s.*); **3.** kassir (*bankda*)
**telling** ['telıŋ] *adj* **1.** təsirli, tutarlı; **a ~ speech** təsirli çıxış; **a ~ argument** tutarlı sübut; **2.** mənalı; əhəmiyyətli
**telltale**[1] ['telteıl] *n* **1.** qeybətçi, boşboğaz; **2.** çuğulçu, xəbərçi
**telltale**[2] ['telteıl] *adj* **1.** xain; satqın; **2.** bildirən, aşkar edən; **a ~ blush** xainlik bildirən qızartı (*sifətdə, üzdə*); **3.** səciyyəvi; ~ **sign** səciyyəvi əlamət
**telly** ['telı] *n d.d.* televizor
**temerity** [tı'merıtı] *n* **1.** mühakiməsizlik; ağılsızlıq, ehtiyatsızlıq; **2.** *amer.* cəsarət, hünər
**temper**[1] ['tempəʳ] *n* **1.** xasiyyət, ədəb; **a sweet ~** yumşaq xasiyyət; **an ill ~** pis / səfeh xasiyyət; **2.** əhval-ruhiyyə; **to be in a good / bad ~** yaxşı / pis əhval-ruhiyyədə olmaq; **3.** təmkin, səbir; dözüm; **to keep *one's* ~** təmkinini saxlamaq; **to lose *one's* ~** özündən çıxmaq; **to put *smb*. out of ~** bir kəsi özündən çıxartmaq; **to recover / to regain *one's* ~** sakitləşmək, özünü ələ almaq; **4.** qəzəb, qeyz, hirs; **to get into a ~** acıqlanmaq, hirslənmək, qəzəblənmək
**temper**[2] ['tempəʳ] *v* **1.** azaltmaq, məhdudlaşdırmaq; yüngülləşdirmək; **2.** bərkitmək, möhkəmlətmək (*metalı*); **to ~ steel** poladı möhkəmlətmək; **3.** *məc.* bərkimək, möhkəmlənmək; *He tempered in battle O, döyüşdə bərkidi*
**temperament** ['tempərəmənt] *n* **1.** temperament, təbiət; **2.** coşğunluq, ehtiras
**temperamental** [,tempərə'mentl] *adj* temperamentli, ehtiraslı, coşğun
**temperance**[1] ['tempərəns] *n* **1.** təmkinlilik, nəfsini saxlaya bilmə (*yeməkdən, spirtli içkilərdən*); **2.** qənaətkarlıq; ayıqlıq
**temperance**[2] ['tempərəns] *adj*: ~ **hotel** spirtli içkilər satılmayan mehmanxana; **a ~ society** spirtli içkilərin ləğv olunduğu cəmiyyət
**temperate** ['tempərıt] *adj* mötədil, mülayim; **a ~ climate** mülayim iqlim; *Be more temperate in your language, please Zəhmət olmasa, danışığına / danışığınıza fikir ver / verin*
**temperature** ['temprıtʃəʳ] *n* **1.** temperatur, hərarət; **to take *one's* ~** temperaturunu ölçmək; **2.** *d.d.* yüksək hərarət / temperatur; **to have / to run a ~** yüksək temperaturu olmaq
**tempest**[1] ['tempıst] *n* fırtına; həyəcan; ◊ **~ in a teapot** boş şey üstündə həyəcan / mübahisə
**tempest**[2] ['tempıst] *v* **1.** həyəcan qaldırmaq; **2.** şiddətlənmək
**tempestuous** [tem'pestjuəs] *adj* tufanlı; coşğun, şiddətli; ~ **night** tufanlı gecə; ~ **wind** şiddətli külək; ~ **debate** coşğun mübahisə
**template** ['templıt] *n tex.* şablon, basmaqəlib
**temple** ['templ] *n* **1.** məbəd; ibadətgah; **2.** templ (*Londondakı iki vəkillər cəmiyyətindən biri və onun yerləşdiyi bina*); **3.** gicgah
**templet** ['templıt] *n* = **template**
**tempo** ['tempou] *n* **1.** *mus.* tempo; **2.** ritm; temp
**temporal** ['tempərəl] *adj* **1.** müvəqqəti; **2.** zaman; **3.** dünyəvi; **4.** *anat.* gicgah
**temporality** [,tempə'rælıtı] *n* müvəqqətilik, müvəqqəti xarakter
**temporary**[1] ['tempərərı] *n* müvəqqəti işçi / qulluqçu
**temporary**[2] ['tempərərı] *adj* müvəqqəti, keçici; ~ **address** müvəqqəti ünvan; ~ **job** müvəqqəti iş; **to be ~** müvəqqəti xarakter daşımaq
**temporize, -ise** ['tempəraız] *v* gecikdirmək; vaxtı qəsdən uzatmaq; ləngitmək
**temporizing, -ising** ['tempəraızıŋ] *adj* ləngidilən, gecikdirilən; **a ~ answer** gecikdirilən cavab
**tempt** [tempt] *v* **1.** tovlamaq, yoldan / başdan çıxartmaq, şirnikdirmək; **2.** yoxlamaq, sınamaq; **to ~ fate** bəxti sınamaq
**temptation** [temp'teıʃn] *n* cazibə, şirnikdirici / başdan çıxaran şey; **to lead *smb*. into ~** bir kəsi yoldan / başdan çıxarmaq
**tempter** ['temptəʳ] *n* tovlayan, yoldan / başdan çıxaran; şirnikdirən, həvəsləndirən
**tempting** ['temptıŋ] *adj* azdırıcı, aldadıcı, tovlayan, yoldan / başdan çıxardan; şirnikdirici, tamahsılandırıcı; həvəsləndirici
**temptress** ['temptrıs] *n* azdıran, tovlayan, yoldan / başdan çıxaran; tamaha salan; şirnikdirən, həvəsləndirən (*qadın*)
**ten** [ten] *num* **1.** on; ~ **times as big** on dəfə çox; **2.** onluq; **3.** on saylı; on ədəd; **Room ~** on saylı otaq; **4.** *pl* onlarla; **~s of thousands of people** on minlərlə adam
**tenable** ['tenəbl] *adj* **1.** məntiqli; idraklı, şüurlu; sağlam; **2.** məntiqə uyğun, ağlabatan; ~ **argument** ağlabatan dəlil; **3.** tutula bilən (*yer, vəzifə və s.*)
**tenacious** [tı'neıʃəs] *adj* **1.** möhkəm, bərk yapışan; ~ **memory** möhkəm yaddaş; **to be ~ of life** həyatdan bərk yapışmaq; **2.** inadlı; ~ **of life** yaşamağa qabil; canıbərk
**tenacity** [tı'næsıtı] *n* **1.** inad, mətanət; tərslik; **2.** möhkəmlik, davamlılıq, dözüm; **3.** yapışqanlıq
**tenancy** ['tenənsı] *n* **1.** icarə, kirayə; **2.** icarə müddəti; **during my ~ of the farm** təsərrüfatı icarəyə götürdüyüm müddətdə; **3.** icarəyə götürülən / verilən torpaq / ev
**tenant**[1] ['tenənt] *n* **1.** icarədar; ~ **at will** möhlətsiz / ömürlük icarədar; **2.** kirayəçi

(*evin, torpağın, mülkiyyətin və s.*); **~ farmer** kirayəçi-fermer; **3.** *hüq.* daşınmaz mülkiyyət sahibi

**tenant**[2] ['tenənt] *v* kirayə etmək, icarəyə götürmək

**tench** [tentʃ] *n zool.* tinqa balığı

**tend** [tend] *v* **1.** qulluq etmək; **to ~ the sick** xəstəyə qulluq etmək; **2.** göz yetirmək, göz-qulaq olmaq; **to ~ sheep** qoyun otarmaq; **to ~ the fire** ocağa göz yetirmək; **3.** meyl göstərmək; *He tends to exaggerate O, şişirtməyə meyllidir / meyl göstərir*

**tendency** ['tendənsı] *n* tendensiya, meyl; qabiliyyət; *He has a tendency to... Onun ...meyli var*

**tendentious** [ten'denʃəs] *adj* meylli, müsbət meylli; tendensiyalı

**tender**[1] ['tendər] *n* **1.** tender, təklif, arzu; **2.** ödəniş vasitəsi / vəsaiti; **legal ~** qanuni ödəniş vəsaiti; **3.** tender; müsabiqə; **4.** üzən baza; **5.** məbləğ (*borcun ödənilməsi üçün*); **6.** xidmət göstərən şəxs; **a baby ~** dayə, qulluq göstərən (*uşağa, xəstəyə*)

**tender**[2] ['tendər] *adj* **1.** zərif; məlahətli, lətif; **~ skin** zərif dəri; **~ voice** məlahətli səs; **~ caress** zərif nəvaziş; **2.** həssas; təsirli; **~ spot** həssas yer, zəif nöqtə

**tender**[3] ['tendər] *v* **1.** təklif etmək; **to ~ *one's* thanks** təşəkkür etmək; **to ~ an apology** üzr istəmək; **to ~ *one's* resignation** istefa vermək; **2.** vermək; irəli sürmək

**tender-eyed** ['tenderaıd] *adj* **1.** zərif baxışlı / gözlü; **2.** zəif görən

**tender-hearted** ['tendə'ha:tıd] *adj* ürəyiyumşaq, rəhmdil, mərhəmətli

**tenderloin** ['tendəlɔın] *n amer.* **1.** can əti; **2.** eyş-işrət yeri

**tenderness** ['tendənıs] *n* **1.** zəriflik, incəlik; **2.** mehribanlıq, şəfqət

**tendon** ['tendən] *n anat.* vətər

**tendril** ['tendrıl] *n bot.* bığcıq

**tenement** ['tenımənt] *n* **1.** çoxmənzilli ev; **2.** *hüq.* yaşayış evi; **3.** icarəyə verilən / götürülən bina / mülkiyyət

**tenet** ['ti:net] *n* **1.** mövqe; müddəa; **2.** ehkam, doktrina

**tenfold** ['tenfould] *adj* onqat, on dəfə, on misli

**tenner** ['tenər] *n* 10 funtluq / 10 dollarlıq banknot

**tennis**[1] ['tenıs] *n* tennis

**tennis**[2] ['tenıs] *adj* tennis; **~ court** tennis kortu; **~ player** tennisçi, tennis oyunçusu

**tenon** ['tenən] *n* **1.** *tik.* mil, diş; çıxıntı; **2.** *tex.* şpilka; dilçək

**tenor** ['tenər] *n* **1.** *mus.* tenor (*səs, müğənni*); **2.** cərəyan; məslək; **3.** ümumi məzmun; **4.** surət, dublikat (*sənəd*)

**tense**[1] [tens] *n qram.* zaman; **the present / past ~** indiki / keçmiş zaman

**tense**[2] [tens] *adj* **1.** gərgin; dartılmış, gərilmiş; **~ atmosphere** gərgin şərait; **~ rope** dartılmış kəndir; **~ nerves** gərilmiş əsəblər; **2.** əsəbi, qızğın

**tense**[3] [tens] *v* **1.** gərmək, gərginləşdirmək; **to ~ *one's* muscles** əzələlərini gərmək; **2.** gərilmək, gərginləşmək; **3.** gərginlik yaratmaq

**tensile** ['tensaıl] *adj* **1.** *tex.* dartıla bilən; elastik; **2.** müxtəlif məna verilə bilən

**tension** ['tenʃn] *n* **1.** gərginlik; **international ~** beynəlxalq gərginlik; **to heighten / to increase ~** gərginliyi artırmaq; **to alleviate / to ease / to lessen / to relieve / to reduce ~** gərginliyi azaltmaq / zəiflətmək; **2.** *el.* gərginlik, cərəyan; **high / low ~** yüksək / zəif gərginlik; **3.** təzad; **political ~** siyasi təzad; **4.** dartılma, gərilmə; **5.** təzyiq (*qaz, buxar və s.*)

**tensity** ['tensıtı] *n* gərgin vəziyyət, gərginlik

**tensive** ['tensıv] *adj* gərginlik yaradan

**tent**[1] [tent] *n* **1.** çadır, alaçıq; **to erect / to pitch / to put up a ~** çadır qurmaq; **to take down a ~** çadır sökmək; **2.** *tib.* tampon, piltə

**tent**[2] [tent] *adj* çadır, alaçıq; **~ city** çadır şəhərciyi

**tent**[3] [tent] *v* **1.** çadır qurmaq; çadırda yaşamaq; **2.** *tib.* tampon / piltə qoymaq; tıxac salmaq

**tentacle** ['tentəkl] *n* **1.** *zool.* buynuz (*böcəklərdə, qurdlarda və s.*); **2.** *bot.* bığcıq

**tentative** ['tentətıv] *adj* **1.** sınaq, yoxlama; *We made tentative plans to move Biz köçmək üçün sınaq planı hazırladıq*; **2.** ilk, ilkin; **to make a ~ suggestion** ilkin təklif irəli sürmək





**tentatively** ['tentətıvlı] *adv* şərti, şərti olaraq

**tent-bed** ['tentbed] *n* səyyar çarpayı

**tenterhooks** ['tentəhuks] *n pl* dartılıb taxılan cəftə;

◊ **to be on ~** ≅ iynə üstündə oturmaq; **to keep *smb.* on ~** ≅ bir kəsi narahat vəziyyətdə saxlamaq

**tenth** [tenθ] *num* onuncu; **one ~ of the population** əhalinin onda bir hissəsi; **three ~s** onda üç

**tenuous** ['tenjuəs] *adj* **1.** nazik; cüzi (*fərq barədə*); **2.** davamsız, tezsınan; *The evidence is a little tenuous Sübut bir qədər tutarlı deyil*; **3.** seyrək (*hava haq.*)

**tenure** ['tenjuər] *n* **1.** sahib olma, yiyələnmə; **2.** olma, qalma; *The President's tenure of office is four years Prezidentin səlahiyyət müddəti dörd ildir*; **3.** əvəzedilməzlik

**tepefy** ['tepıfaı] *v* yüngülcə isitmək; isinmək

**tepid** ['tepıd] *adj* **1.** istitəhər; ılıq; **2.** *məc.* soyuq (*əlaqə, münasibət və s. haq.*)

**tercel** ['tə:səl] *n* şahin, qızılquş, tərlan (*erkək*)

**tercentenary** [,tə:sen'ti:nərı] *n* üçyüzillik; üçyüzillik ildönümü

**tercet** ['tə:sıt] *n* **1.** üç misradan ibarət şer / bənd; **2.** *mus.* terset

**teredo** [tər'i:dou] *n zool.* gəmi qurdu; ağacovan qurd

**terete** [te'ri:t] *adj* silindrşəkilli, silindrik

**tergal** ['tə:gəl] *adj anat.* bel, dorsal

**term**[1] [tə:m] *n* **1.** müddət; **~ of lease** kirayə müddəti; **to be elected for a four-year ~** dördillik müddətə seçilmək; **2.** semestr, yarımillik; **end-of- ~ examinations** semestr imtahanları; **3.** termin; **technical / scientific ~** texniki / elmi termin; **a contradiction in ~s** terminlər arasındakı ziddiyyət; **4.** *d.d.* hədd, sərhəd; **5.** *pl* ifadə, izhar, **in flattering ~s** xoşagələn ifadələrlə; **6.** *pl* şərt(lər) (*müqavilədə, sazişdə*); **on favourable ~s** əlverişli / münasib şərtlərlə; **~s of payment** ödəniş şərtləri; **7.** *pl* münasibətlər; **to be on good / bad ~s (with)** bir kəslə yaxşı / pis münasibətdə olmaq; **8.** *riyaz.* hədd

**term**[2] [tə:m] *v* ifadə etmək, adlandırmaq; *I term it a disgrace Mən bunu biabırçılıq adlandırıram; He has no right to term himself a professor Onun özünü professor adlandırmağa haqqı yoxdur*

**termagant**[1] ['tə:məgənt] *n* ifritə, acıdil (*qadın*)

**termagant**[2] ['tə:məgənt] *adj* davakar, cəncəl

**terminal**[1] ['tə:mnl] *n* **1.** vağzal, sonuncu stansiya; **air ~** aerovağzal; **2.** *el.* klemma; **the ~s of a battery** batareyanın klemmaları; **3.** terminal; **Sangachal ~** Səngəçal terminalı

**terminal**[2] ['tə:mnl] *adj* **1.** sonuncu, yekun; **~ station** sonuncu stansiya; **2.** *tib.* son; ağır; *He is a terminal case O, ölümcül / ağır xəstədir*

**terminate** ['tə:mıneıt] *v* **1.** son qoymaq; xitam vermək; **to ~ a contract** müqaviləni pozmaq; **2.** qurtarmaq; **to ~ pregnancy** hamiləlikdən yarımçıq qurtarmaq; **words that ~ in a vowel** saitlə qurtaran sözlər

**termination** [,tə:mı'neıʃn] *n* **1.** son, yekun, axır; **2.** kəsmə; qurtarma; **3.** pozma, ləğv etmə (*sazişi, müqaviləni və s.*)

**terminology** [,tə:mı'nɔlədʒı] *n* terminologiya; terminlər, istilahlar

**termitary** ['tə:mıtərı] *n* (ağ) qarışqa yuvası

**termite** ['tə:maıt] *n* termit, ağ qarışqa

**termless** ['tə:mlıs] *adj* **1.** hədsiz, sərhədsiz; **2.** müddətsiz; **3.** şərtsiz; müstəqil

**term-time** ['tə:mtaım] *n* dərs müddəti / vaxtı

**tern** [tə:n] *n* su qaranquşu

**ternary**[1] ['tə:nərı] *n* üç, üçlük; triada

**ternary**[2] ['tə:nərı] *adj* üçqat; üç hissəli

**terrace** ['terəs] *n* **1.** terras, səki; **2.** eyvan, artırma; **3.** evlərin cərgəsi (*küçə boyu*); **4.** *id.* tribuna; **the ~s** stadionun tribunaları

**terrain** ['tereın] *n* **1.** yer; ərazi; **~ of attack** hücum yeri; **2.** topoqrafiya

**terrapin** ['terəpın] *n* **1.** su tısbağası; **2.** tısbağa əti

**terrestrial** [tı'restrıəl] *adj* **1.** dünyəvi; **2.** quru; **the ~ parts of the world** dünyanın quru hissələri

**terrible** ['terəbl] *adj* **1.** dəhşətli, qorxulu; **a ~ tragedy** dəhşətli faciə; **2.** şiddətli; son dərəcə; **3.** *d.d.* çox pis; **~ weather** çox pis hava

**terribly** ['terəblı] *adv* olduqca, son dərəcə; *I am terribly tired Mən son dərəcə yorulmuşam*

**terrier** ['terɪər] *n* teryer (*it cinsi*)
**terrific** [tə'rɪfɪk] *adj* **1.** dəhşətli, qorxunc; ~ **speed** dəhşətli dərəcədə yüksək sürət; ~ **noise** qorxunc səs; **2.** *d.d.* çox gözəl / qəşəng; təəccüblü; heyranedici
**terrify** ['terɪfaɪ] *v* bərk qorxutmaq, dəhşətə / vahiməyə salmaq; *It terrifies us that there may be another earthquake Daha bir zəlzələnin baş verməsi bizi bərk qorxudur*
**terrifying** ['terɪfaɪɪŋ] *adj* dəhşətli, qorxulu; *It is terrifying that there are so many drunk drivers on the road Yolda bu qədər sərxoş sürücülərin olması dəhşətdir*
**territorial** [,terɪ'tɔ:rɪəl] *adj* ərazi; torpaq, məhəlli; ~ **waters** məhəlli sular; ~ **claims** ərazi iddiaları; ~ **army** məhəlli ordu
**territory** ['terɪtərɪ] *n* ərazi, torpaq, sahə, yer; **to occupy** ~ ərazini işğal etmək; **neutral** ~ neytral sahə / ərazi
**terror** ['terər] *n* **1.** qorxu, vahimə; **to run away in** ~ vahimə içərisində qaçıb getmək; **to be in** ~ **of** ***one's*** **life** həyatından / canından qorxmaq; **2.** qorxu törədən şey / şəxs; **to strike** ~ **into the hearts of people** camaatın ürəyinə qorxu salmaq; **3.** *siya.* terror
**terrorism** ['terərɪzm] *n* terrorizm, terrorçuluq; *Terrorism is a crime Terrorizm cinayətdir*
**terrorist** ['terərɪstl] *n* terrorçu, tədhişçi
**terrorize, -ise** ['terəraɪz] *v* qorxutmaq, dəhşətə / qorxuya salmaq
**terror-stricken** ['terə,strɪkən] *adj* vahimə / qorxu içərisində olan
**terry** ['terɪ] *n* **1.** xov; narın tük; **2.** *amer.* = **terry-cloth**
**terry-cloth** ['terɪkləθ] *n* saçaqlı parça
**terse** [tə:s] *adj* **1.** qısa, yığcam (*üslub*); müxtəsər; **2.** öz fikrini yığcam söyləyən (*natiq haq.*)
**terseness** ['tə:snɪs] *n* yığcamlıq, müxtəsərlik
**tertian** ['tə:ʃən] *n tib.* malyariya; qızdırma
**tessellated** ['tesɪleɪtɪd] *adj* mozaik, quraşdırılma; **a** ~ **pavement** mozaik / dama-dama səki
**test**[1] [test] *n* **1.** sınaq, yoxlama; **to put to** ~ sınamaq; **to bear the** ~ sınağa dözmək; **underground nuclear** ~ yeraltı nüvə sınağı; **2.** imtahan; yoxlama işi; **spelling** ~ orfoqrafik imla; **a driving** ~ sürücülük imtahanı; **3.** *tib.* analiz; **a blood** ~ qan analizi
**test**[2] [test] *adj* sınaq, yoxlama; ~ **flight** sınaq uçuşu; ~ **match** yoxlama görüşü
**test**[3] [test] *v* sınamaq, yoxlamaq, sınaqdan / təcrübədən keçirmək; **to** ~ **(out) a new aircraft** yeni təyyarəni sınaqdan keçirmək; **to** ~ **a metal for duration** metalın davamlılığını yoxlamaq; **to** ~ **a theory out in practice** nəzəriyyəni təcrübədə yoxlamaq; **to** ~ **a new drug** təzə dərmanı sınaqdan keçirmək; **to have** ***one's*** **eyesight** ~ **ed** görmə qabiliyyətini yoxlatdırmaq
**testament** ['testəmənt] *n* **1.** vəsiyyət; vəsiyyətnamə; **last will and** ~ son istək və vəsiyyət; **2.** məsləhət
**testamentary** [,testə'mentərɪ] *adj* vəsiyyətlə; vəsiyyətnamə ilə verilən
**testator** [tes'teɪtər] *n* vəsiyyət edən, vəsiyyətçi
**testatrix** [tes'teɪtrɪks] *n* vəsiyyət edən qadın
**test ban** ['testbæn] *n* nüvə sınaqlarının qadağan olunması
**tester** ['testər] *n* **1.** sınaqçı, təcrübəçi; **2.** laborant, laboratoriya işçisi; **3.** sınaq cihazı; **4.** bəzəkli talvar, taxt-rəvan
**testicle** ['testɪkl] *n anat.* yumurtacıq; xaya
**testify** ['testɪfaɪ] *v* **1.** ifadə vermək; şahidlik etmək; **to** ~ **to** lehinə ifadə vermək; **to** ~ **against** əleyhinə ifadə vermək; **to** ~ **in favour of** ***smth.*** bir şeyin xeyrinə ifadə vermək; **2.** təntənəli surətdə elan etmək / məlumat vermək; **3.** sübut / təsdiq etmək
**testimonial**[1] [,testɪ'mounjəl] *n* **1.** xasiyyətnamə; zəmanət, zəmanət məktubu; **2.** kollektiv hədiyyə
**testimonial**[2] [,testɪ'mounjəl] *adj* təşəkkür bildirən; tövsiyə edilən; ~ **dinner** şərəfə verilən ziyafət
**testimony** ['testɪmənɪ] *n* **1.** şahid ifadəsi; **false** ~ yalan ifadə; **to give** ~ ifadə vermək; **2.** sübut, dəlil; **3.** təsdiqlənmə; fikir; müddəa; iddia
**test-mixer** ['test,mɪksər] *n* menzurka
**test-paper** ['test,peɪpər] *n* **1.** reaktiv pambıq / kağız; **2.** *amer.* imzanı tutuşdurmaq / yoxlamaq üçün istifadə olunan sənəd





**test pilot** ['test'paɪlət] *n* sınaqçı təyyarəsürən
**test-tube** ['testtju:b] *n* sınaq borusu / şüşəsi
**testy** ['testɪ] *adj* əsəbi, tündxasiyyət, hövsələsiz
**tetanic** [tɪ'tænɪk] *adj tib.* tetanus; ~ **microbe** tetanus mikrobu
**tetanus** ['tetənəs] *n* **1.** *tib.* tetanus; **2.** donuxma, quruyub / çaşıb qalma
**tetchy** ['tetʃɪ] *adj* küsəyən, dəymədüşər; **a** ~ **horse** köhlən at
**tête-à-tête**[1] ['teɪt a: 'teɪt] *n fr.* **1.** üzbəüz / göz-gözə söhbət; **2.** məxsusi görüş (*iki nəfərin*)
**tête-à-tête**[2] ['teɪt a: 'teɪt] *adj fr.* məxfi, məxsusi, xudmani; **a cosy** ~ **dinner** rahat xudmani nahar
**tether**[1] ['teðər] *n* **1.** ip, qayış, hörük; **2.** *məc.* hədd; son hədd / nöqtə; *I am at the end of my tether Mənim daha səbrim tükənib*
**tether**[2] ['teðər] *v* **1.** bağlamaq, bənd etmək, hörükləmək; *He tethered his horse to the tree O, atını ağaca bağladı*; **2.** *məc.* məhdudlaşdırmaq; hədd / sərhəd qoymaq
**tetralogy** [te'trælədʒɪ] *n* tetralogiya
**tetrastich** ['tetrəstɪk] *n ədəb.* beyt, bənd; dördsətirli şer
**tetrasyllable** ['tetrə,sɪləbl] *n* dördhecalı söz
**tetter** ['tetər] *n tib.* dəmrov; qoturluq
**Teuton** ['tju:tən] *n* tevton, german / alman tayfası
**Teutonic** [tju:'tɔnɪk] *adj:* qədim german; ~ **languages** qədim german dilləri
**text** [tekst] *n* **1.** mətn; **to annotate a** ~ mətnə annotasiya yazmaq; **2.** mövzu; **to stick to** ***one's*** ~ mövzudan uzaqlaşmamaq; **3.** şrift (*mətbəədə*)
**textbook** ['tekstbuk] *n* dərslik, dərs kitabı
**textile**[1] ['tekstaɪl] *n* **1.** parça, qumaş; **2.** *pl:* ~ **s** toxunma mallar / parçalar
**textile**[2] ['tekstaɪl] *adj* toxuculuq; ~ **industry** toxuculuq sənayesi
**textual** ['tekstjuəl] *adj* **1.** mətn; ~ **errors** mətn səhvləri; **2.** mətnə tam uyğun, hərfi; ~ **translation** hərfi tərcümə; ~ **version** mətnə uyğun variant
**texture** ['tekstʃər] *n* **1.** *geol.* tekstura; **2.** quruluş; **the** ~ **of minerals** mineralların quruluşu; **3.** *anat. biol.* toxuma; **a skin of fine / coarse** ~ zərif / kobud toxumalı dəri; **4.** xüsusiyyət; əsas məzmun, məğz (*bədii incəsənət əsərində*); **the** ~ **of verse** şerin xüsusiyyəti / məziyyəti
**than** [ðæn, ðən, ðn] *conj* **1.** **-dan, -dən**; *I am taller than you Mən səndən / sizdən hündürəm*; **sooner** ~ **expected** gözlənildiyindən tez; *I have never met anyone more stupid than you Mə səndən / sizdən səfeh / axmaq adama heç vaxt rast gəlməmişəm*; **2.** **-sa, -sə**; *Better late than never Heç olmamaqdansa, gec olmağı yaxşıdır*; **3.** **-ca, -cə**; *He knows better than to deceive me O yaxşıca bilir ki, məni aldatmaq olmaz*
**thank** [θæŋk] *v* təşəkkür etmək, minnətdarlıq bildirmək; **to** ~ **someone for a gift** hədiyyəyə görə bir kəsə təşəkkür etmək; **to** ~ **sincerely** səmimi minnətdarlıq bildirmək / etmək; *Thank you very much Çox sağ ol / olun; Thank God! Allaha şükür!*
**thankful** ['θæŋkfl] *adj* minnətdar, yaxşılıq / qədir bilən; **to be** ~ **1)** minnətdar olmaq; **2)** Allaha şükür etmək
**thankless** ['θæŋklɪs] *adj* **1.** naşükür, nankor; **2.** səmərəsiz, qoyulan zəhmətə dəyməyən; **a** ~ **task** səmərəsiz tapşırıq; **a** ~ **job** zəhmətinə dəyməyən iş
**thanks** ['θæŋks] *n pl* təşəkkür, razılıq, minnətdarlıq; *Many thanks! Çox sağ ol / olun!*; ~ **to**… …sayəsində, …görə, …üzündən; *We completed this work on time thanks to your help Sənin / Sizin köməyin / köməyiniz sayəsində biz bu işi vaxtında başa çatdırdıq*
**thanksgiving**[1] ['θæŋks,gɪvɪŋ] *n* **1.** şükran duası; **2.** razılıq, təşəkkür
**thanksgiving**[2] ['θæŋks,gɪvɪŋ] *adj* şükranlıq; **Thanksgiving Day** *amer.* Şükranlıq günü
**thankworthy** ['θæŋk,wə:ðɪ] *adj* təşəkkürə / razılığa layiq
**that**[1] [ðæt] *demon. pron.* (*pl* **those**) **1.** o; ~ **book** o kitab; ~ **house** o ev; ~ **day** o gün; *That is true O həqiqətdir*; **2.** *İsmin əvvəlində işlənir; The climate here is like that of France Buranın iqlimi Fransanın iqliminə bənzəyir*
**that**[2] [ðæt] *rel. pron. Bu halda* **that** *nisbi əvəzliyi Azərbaycan dilinə tərcümə edilmir:* **the members** ~ **were present** iştirak edən üzvlər; **the book** ~ **I'm reading**

mənim oxuduğum kitab; *Where is the book that I was reading? Mənim oxuduğum kitab haradadır?*

**that[3]** [ðæt] *adv* elə, o qədər, o dərəcədə; *The man was that angry he couldn't say a word Kişi o dərəcədə / o qədər hirslənmişdi ki, heç bir söz də deyə bilmədi*

**that[4]** [ðæt] *conj Budaq cümlələrini baş cümləyə bağlayır:*...ki; *I admit that I was wrong Boynuma alıram ki, mən səhv etmişəm; She said that she would come O dedi ki, gələcək*

**thatch[1]** [θætʃ] *n* taxtapuş küləşi; qamış, qarğı

**thatch[2]** [θætʃ] *v* küləşlə / qamışla örtmək

**thaw[1]** [θɔ:] *n* **1.** yumşaq / mülayim hava; **2.** ərimə; **3.** istiləşmə; yumşalma (*münasibətlərdə*)

**thaw[2]** [θɔ:] *v* **1.** ərimək, donu açılmaq; **2.** əritmək, donunu açmaq; **to leave frozen food to ~ before cooking it** bişirməmişdən qabaq dondurulmuş ərzağın donunu açmaq; **3.** yumşalmaq, ürəyi açılmaq; *A good dinner with wine helped to thaw out our guests Şərabla verilən yaxşı nahar qonaqlarımızın ürəyini açdı;* **4.** qızınmaq, qızışmaq; isinmək

**the** [ðə; ði:] *müəyyənlik artikli:* **1.** *İsimlərlə işlədilərək əşya və hadisələr sinfindən hər hansı predmeti, əşyanı, hadisəni ayırmağa xidmət göstərir: Bu halda* **the** *müəyyənlik artikli Azərbaycan dilində: 1) təsirlik hal şəkilçilərinə* (**-ı, -i, -u, -ü**) *uyğun gəlir; Give me the book Kitabı mənə ver / verin; Put the pen on the table Qələmi stolun üstünə qoy / qoyun; Take the table from here Stolu buradan götür / götürün; Pour the milk into the jar Südü bardağa tök / tökün; 2) Tərcümə edilmir: The chair is in the room Stol otaqdadır; The book is in the bag Kitab çantanın içindədir;* **2.** *Haqqında danışılan əşya və ya şəxsin danışana məlum olduğunu bildirir; The man has come again Kişi yenə də gəlib;* **3.** *Verilən əşya və ya şəxsin müstəsna, yaxud daha münasib olduğunu bildirir və Azərbaycan dilinə tərcümə edilmir; Of all the men I know he is the man for the position Tanıdığım adamların hamısından bu vəzifə üçün o, ən layiqli adamdır;* **~ football player of the year** ilin (ən yaxşı) futbolçusu; **4.** *Bir sinfə daxil olan isimləri ümumiləşdirir, onlardan birinə aid olan xüsusiyyətin həmin sinfin hər bir üzvünə aid olduğunu bildirir və Azərbaycan dilinə tərcümə edilmir: The horse is a useful animal At faydalı heyvandır;* **5.** *Vahidlik anlayışlarını ifadə edir və Azərbaycan dilinə tərcümə edilmir:* **the** sun günəş; **the** moon ay; **6.** *Substantivləşmiş sifətlərdə ümumiləşdirilmiş məna ifadə edir:* **the** poor kasıblar; **the** rich dövlətlilər; **7.** *Sifətlərin qarşısında işlənərək təxəllüs və ya ləqəb ifadə edir və Azərbaycan dilinə tərcümə edilmir:* Peter **the** Great **Böyük** Pyotr; Hasan **the** Long **Uzun** Həsən; **8.** *Müqayisə dərəcəsindəki zərflərlə işlədilərək* **-sa, -sə** *şəkilçilərinə və* **nə qədər... o qədər...** *söz birləşməsinə uyğun gəlib eyni hadisə və ya şeyin bərabər şəkildə artması və ya azalmasını bildirir: The sooner the better* **Nə qədər** *tez olarsa,* **o qədər** *yaxşıdır; The more he gets, the more he wants* **Nə qədər** *çox alırsa,* **o qədər** *də çox istəyir*

**theater** [ˈθıətəʳ] *n amer.* = **theatre**

**theatre** [ˈθıətəʳ] *n* **1.** teatr; **to go to the ~** teatra getmək; **2.** auditoriya; **3.** operasiya otağı; **operating ~** cərrahiyyə otağı; **4.** meydan; **the ~ of war** hərbi əməliyyat / müharibə meydanı; **5.** dramatik ədəbiyyat; pyeslər

**theatre-goer** [ˈθıətə,gouəʳ] *n* teatr həvəskarı

**theatrical[1]** [θıˈætrıkəl] *n* **1.** peşəkar aktyor; **2.** *pl* tamaşa, teatr tamaşası

**theatrical[2]** [θıˈætrıkəl] *adj* **1.** teatr; səhnə; **~ hall** teatr zalı; **2.** *məc.* qeyri-təbii, süni

**theatricality** [θı,ætrıˈkælıtı] *n* qeyri-təbiilik, sünilik

**theatricalize, -ise** [θıˈætrıkəlaız] *v* səhnələşdirmək, səhnəyə qoymaq

**theatrics** [θıˈætrıks] *n pl.* səhnə sənəti

**theft** [θeft] *n* oğurluq; **~ of government property** dövlət mülkiyyətinin oğurluğu; **to commit a ~** oğurluq etmək

**their** [ðeəʳ] *pron.* **1.** onların; **~ mother / father** onların anası / atası; **2.** *Bəzən Azərbaycan dilinə tərcümə edilmir: They sold their house Onlar evlərini satdılar*





**theirs** [ðeəz] *poss. pron* onlarınkı; *This book is theirs Bu kitab onlarınkıdır*

**theism** [ˈθi:ızəm] *n fəls.* teizm

**theist** [ˈθi:ıst] *n fəls.* teist

**them** [ðem; ðəm] *pron.* onları, onlara; *I saw them Mən onları gördüm; Give them the money Pulu onlara ver / verin*

**thematic** [θıˈmætık] *adj* tematik; **~ catalogue** tematik kataloq; **~ plan** tematik plan

**theme** [θi:m] *n* **1.** mövzu, tema; **a contemporary ~** müasir mövzu; **2.** obyekt, məqsəd; **a ~ for discussion** müzakirə obyekti; **3.** *mus.* tema; melodiya

**themselves** [ðəmˈselvz] *ref. pron* **1.** özlərinə; özlərini; *They have built themselves a house Onlar özlərinə ev tikiblər; They behavioured themselves badly Onlar özlərini pis apardılar;* **2.** onlar özləri; *They don't know themselves Onlar heç özləri də bilmirlər*

**then[1]** [ðen] *adj* o vaxtkı, o zamankı, ondakı; **the ~ President** o zamankı prezident; **the ~ ruling party** o vaxtkı hakim partiya; **the ~ Prime Minister** o zamankı baş nazir

**then[2]** [ðen] *adv* **1.** onda, o vaxt, o zaman; *We were young then Onda biz cavan idik; Where were you living then? O vaxt sən / siz harada yaşayırdın / yaşayırdınız?* **2.** sonra; ondan sonra; *First we went to London and then to Paris Biz əvvəlcə Londona, sonra isə Parisə getdik;* **3.** onda; o halda; *If you are tired then you'd better stay at home Əgər sən / siz yorğunsansa / yorğunsunuzsa, onda yaxşı olar ki, evdə qalasan / qalasınız;* **4.** ondan başqa; bundan əlavə; *And then, you must remember... Bundan başqa, yadda saxlamalısan / saxlamalısınız ki,...; I love my job and then it pays so well Mən öz işimi sevirəm və bir də ki, yaxşı maaşı var;* **5.** deməli; *Then you're not coming Deməli, sən / siz gəlmirsən / gəlmirsiniz;* **since ~** o vaxtdan / o zamandan bəri; **now and ~** vaxtaşırı; hərdənbir; **till ~** o vaxtadək, o zamana qədər

**thence** [ðens] *adv* **1.** oradan; *We flew to Boston and thence to Washington Biz Bostona, oradan da Vaşinqtona uçduq;* **2.** buradan, bu səbəbdən; buna görə (də), deyilənlərdən; *It follows, thence, that... Deyilənlərdən belə çıxır ki,...*

**thenceforth** [ˈðensˈfɔ:θ] *adv* o vaxtdan bəri, o vaxtdan; bundan belə

**thenceforward** [ˈðensˈfɔ:wəd] *adv* = **thenceforth**

**theocracy** [θıˈɔkrəsı] *n* teokratiya

**theocratic** [θıəˈkrætık] *adj* teokratik; **~ system** teokratik quruluş / sistem

**theologian** [θıəˈloudʒjən] *n* ilahiyyatçı

**theological** [θıəˈlɔdʒıkəl] *adj* ilahiyyat; **~ seminary / school** ruhani seminariyası / məktəbi

**theology** [θıˈɔlədʒı] *n* ilahiyyat, din elmi

**theorem** [ˈθıərəm] *n* teorem

**theoretic** [θıəˈretık] *adj* nəzəri

**theoretical** [,θıəˈretıkl] *adj* = **theoretic**

**theoretician** [,θıərəˈtıʃn] *n* nəzəriyyəçi

**theoretics** [θıəˈretıks] *n pl* nəzəriyyə

**theorist** [ˈθıərıst] *n* nəzəriyyəçi

**theorize, -ise** [ˈθıəraız] *v* nəzəri mühakimə yürütmək; nəzəri məsələlərlə məşğul olmaq

**theory** [ˈθıərı] *n* **1.** nəzəriyyə; **to advance / to propose a ~** nəzəriyyə irəli sürmək / təqdim etmək; **to confirm a ~** nəzəriyyəni təsdiq etmək; **to develop a ~** nəzəriyyəni inkişaf etdirmək; **to combine ~ and practice** nəzəriyyə ilə təcrübəni birləşdirmək; **2.** fərziyyə; ehtimal; güman

**therapeutic** [,θerəˈpju:tık] *adj tib.* terapevt; daxili xəstəliklər

**therapeutist** [,θerəˈpju:tıst] *n tib.* terapevt

**therapist** [ˈθerəpıst] *n tib.* fizioterapevt; psychotherapist psixoterapevt (*psixoterapiya mütəxəssisi olan həkim*); **speech ~** loqoped

**therapy** [ˈθerəpı] *n* terapiya, müalicə; **physical ~** fizioterapiya; **speech ~** loqopediya; **to be in ~** müalicə olunmaq

**there** [ðeə] *adv* **1.** orada; **2.** ora, oraya; **~ and back** ora və geriyə, ikibaşa; **3.** oradan; **4.** burada, bu yerdə; *I disagree with you there Burada mən səninlə / sizinlə razı deyiləm;* **5.** burada, bununla; *The matter didn't end there Məsələ bununla qurtarmadı;* **6.** odur orada, odur ey; budur bax (*diqqəti cəlb etmək üçün işlədilir*); *There he comes! Budur ey, o gəlir!* **over ~** bax, orada; **~ and then** buradaca, dərhal; **7.** *formal söz kimi:*

to be *feli ilə birgə "var", "olar" mənalarını ifadə edir; There is reason to believe that... İnanmağa əsas vardır ki, ...*
**thereabout(s)** [ˈðeərəbaut(s)] *adv* yaxında, oralarda, yaxınlığında; *He lives in London or thereabout O, Londonda və yaxud onun yaxınlığında yaşayır*
**thereafter** [ðeərˈa:ftəʳ] *adv* ondan / bundan sonra; gələcəkdə
**thereby** [ˈðeəˈbaɪ] *adv* beləliklə, bu surətdə, bununla əlaqədar
**therefore** [ˈðeəfɔ:] *adv* buna görə, bu səbəbdən; odur ki; beləliklə
**therefrom** [ðeəˈfrɔm] *adv d.d.* oradan
**therein** [ðeərˈɪn] *adv d.d.* **1.** bununla; burada; ora, oradakı; **the earth and all ~** yer kürəsi və orada olanların hamısı; **2.** bu cəhətdən
**thereof** [ðeərˈɔv] *adv d.d.* hamısını, orada olanın hamısı; *I lifted the cup and drank thereof Fincanı qaldırdım və hamısını içdim*
**thereon** [ðeərˈɔn] *adv d.d.* bununla; bundan sonra
**thereto** [ðeəˈtu:] *adv* bundan başqa, bununla yanaşı
**therewith** [ðeəˈwɪθ] *adv* **1.** bununla yanaşı, bununla; **2.** dərhal, tez, təcili
**thermal** [ˈθə:məl] *adj* **1.** termik, istilik; **~ energy** istilik enerjisi; **~ power station** istilik elektrik stansiyası; **2.** isti, qaynar; **~ springs** qaynar / isti bulaqlar; **~ unit** istilik vahidi
**thermic** [ˈθə:mɪk] *adj* istilik, termik
**thermodynamics** [ˈθə:moudaɪˈnæmɪks] *n pl fiz.* termodinamika
**thermo-electric** [ˈθə:mouɪˈlektrɪk] *adj* termoelektrik
**thermo-electricity** [ˈθə:mouɪlekˈtrɪsɪtɪ] *n* termoelektrik
**thermograph** [ˈθə:mougra:f] *n* termoqraf
**thermometer** [θəˈmɔmɪtəʳ] *n* termometr, istilikölçən
**thermonuclear** [ˈθə:mouˈnju:klɪəʳ] *adj* istilik-nüvə; **~ weapon** istilik-nüvə silahı; **~ bomb** hidrogen bombası
**thermopile** [ˈθə:moupaɪl] *n* termoelement
**thermoplegia** [ˈθə:mouˈpli:dʒɪə] *n tib.* gün vurma
**thermos** [ˈθə:mɔs] *n* termos
**thermostable** [ˌθə:mouˈsteɪbl] *adj* istiyədavamlı
**thermostat** [ˈθə:məstæt] *n* termostat
**thermotechnics** [ˈθə:mouˈteknɪks] *n pl* istilik texnikası
**thesaurus** [θɪˈsɔ:rəs] *n* **1.** tezarus; **2.** *məc.* xəzinə; anbar
**these** [ði:z] *pron* bunlar; bu; **~ houses** bu binalar; **one of ~ days** bu günlərdə
**thesis** [ˈθi:sɪs] *n* **1.** tezis; əsas fikir; müddəa; **2.** dissertasiya; **3.** inşa / oçerk mövzusu
**thespian**[1] [ˈθespɪən] *n* dramatik aktyor və ya aktrisa
**thespian**[2] [ˈθespɪən] *adj ədəb.* dramatik, faciəvi
**theurgy** [ˈθi:ə:dʒɪ] *n* sehrbazlıq, cadugərlik, ovsunçuluq
**thews** [θju:z] *n pl* **1.** əzələlər; **2.** əzələ qüvvəsi
**they** [ðeɪ] *pron.* onlar; *They went Onlar getdilər*
**thick**[1] [θɪk] *n* **1.** qalınlıq, cəngəllik (*meşədə*); **in the ~ of the forest** meşənin qalınlığında, cəngəllikdə; **2.** mərkəz, iç; **in the ~ of it** lap mərkəzində / içində (*hadisələrin və s.*); **3.** qızğın çağ / vaxt; **in the ~ of the fight** döyüşün qızğın çağında
**thick**[2] [θɪk] *adj* **1.** qalın; yoğun; **a ~ carpet** qalın xalça; **2.** qara; **~ print** qara şrift; **3.** sıx, qatı; **~ hair** sıx saç; **~ fog** qatı duman; **4.** sıx-sıx, dalbadal; **~ shower of blows** dolu kimi yağan zərbələr; **5.** bulanıq (*maye haq.*); **6.** boğuq, xırıltılı; **in a ~ voice** xırıltılı səslə; **7.** *d.d.* səfeh; korazehin; **8.** yaxın, ayrılmaz; **9.** anlaşılmaz, aydın olmayan, yaxşı eşidilməyən; *That is a bit / too thick! Bu lap ağ oldu!*
**thick**[3] [θɪk] *adv* **1.** qalın, qalın-qalın; bol; *He cut the bread thick O, çörəyi qalın-qalın doğradı;* **2.** tez-tez; sıx-sıx; **3.** kəkələyə-kəkələyə; **to speak ~** kəkələyə-kəkələyə danışmaq
**thicken** [ˈθɪkən] *v* **1.** qalınlaşdırmaq; qalınlaşmaq; **2.** qatılaşmaq, qəlizləşmək, laxtalanmaq; *The fog is thickening Duman qatılaşır;* **3.** sıxlaşdırmaq, sıxlaşmaq; **4.** mürəkkəbləşmək; *The plot thickens Süjet mürəkkəbləşir*
**thicket** [ˈθɪkɪt] *n* qalın meşə, sıx meşəlik, cəngəllik





**thick-headed** [ˈθɪkˈhedɪd] *adj* küt, korazehin, kütbeyin
**thickness** [ˈθɪknɪs] *n* **1.** qalınlıq; **one metre in ~** bir metr qalınlığında; **2.** sıxlıq, kiplik; **3.** qat, lay, təbəqə; **three ~es of material** üç qat parça / qumaş
**thickset** [ˈθɪkˈset] *adj* **1.** iri və möhkəm köklü; **2.** sıx əkilmiş; **~ trees** sıx əkilmiş ağaclar; **3.** möhkəm, yoğun
**thick-skinned** [ˈθɪkˈskɪnd] *adj məc.* gönüqalın, kobud; **a ~ man** gönüqalın adam
**thick-skulled** [ˈθɪkˈskʌld] *adj* səfeh, başıboş, küt
**thief** [θi:f] *n* oğru; **gang of thieves** oğru dəstəsi, banda;
◊ **to set a ~ to catch a ~** oğrunu tutmağı oğruya tapşırmaq; ≅ qoyunu qurda tapşırmaq
**thieve** [θi:v] *v* oğurlamaq, oğurluq etmək
**thievery** [ˈθi:vərɪ] *n* **1.** oğurluq; **2.** oğurluq mal / şey
**thievish** [ˈθi:vɪʃ] *adj* **1.** əliəyri; **2.** hiyləgər
**thievishly** [ˈθi:vɪʃlɪ] *adv* **1.** oğrun-oğrun; **to look ~** oğrun-oğrun baxmaq; **2.** şərəfsizcəsinə
**thigh** [θaɪ] *n* omba, bud
**thigh-bone** [ˈθaɪboun] *n* omba / bud sümüyü
**thill** [θɪl] *n* dişlə, əskeş
**thimble** [ˈθɪmbl] *n* **1.** üskük, oymaq; **2.** ucluq; **3.** *tex.* halqa, mufta
**thimbleful** [ˈθɪmblful] *n* **1.** udum, qurtum; **2.** bir çimdik; **~ of salt** bir çimdik duz; **3.** damcı; **~ of water** dir damcı su
**thin**[1] [θɪn] *adj* **1.** nazik, incə; **~ line** nazik xətt; **~ shirt** nazik köynək; **2.** arıq, sısqa; **~ as a lath / a rail** yonqar / talaşa kimi arıq; **rather ~ in the face** üzdən / sifətdən xeyli arıq; *Your illness has left you very thin Xəstəlik səni / sizi çox arıqladıb;* **3.** seyrək, az; *His hair is getting thin Onun saçları seyrəlir;* **a ~ forest** seyrək meşə; **a ~ crowd** seyrək izdiham; *The audience is a bit thin Camaat bir qədər azdır;* **4.** duru; **~ soup** duru şorba; **5.** zəif, miskin; ucuz; **a ~ plot** zəif süjet; **~ story** zəif hekayə; **6.** əsassız, tutarsız; **a ~ excuse** tutarsız bəhanə; **7.** *d.d.* pis; xoşagəlməz; **to have a ~ time** pis vaxt keçirmək;
◊ *That is too thin Bu, açıq görünür,* ≅ *Xoruzun quyruğu görünür*
**thin**[2] [θɪn] *v* **(-nn-)** **1.** arıqlamaq; **2.** naziltmək; itiləmək; **3.** seyrəltmək, seyrəlmək; *He thinned the seedlings O, şitilləri seyrəltdi; The crowd have thinned out İzdiham / Camaat seyrəlib;* **4.** boşalmaq; tənhalaşmaq; **6.** köhnəlmək, süzülmək (*paltar, geyim və s.*)
**thin**[3] [θɪn] *adv* nazik, incə, incəliklə; *You've spread the butter very thin Sən / Siz yağı lap nazik yaxmısan / yaxmısınız*
**thing** [θɪŋ] *n* **1.** şey, əşya, predmet, cisim; *What do you call this thing? Sən / Siz bu şeyi necə adlandırırsan / adlandırırsınız?;* **2.** iş, fakt; şərait; hadisə; *It is a strange thing! Qəribə işdir! Things look promising Vəziyyət ümidverici görünür;* **all ~s considered** bütün cəhətləri / hər şeyi nəzərə alaraq; **3.** ləvazimat, avadanlıq; **tea ~s** çay ləvazimatı; **4.** ədəbi-bədii və ya-xud musiqi əsəri; hekayət; **5.** məxluq, insan; heyvan; *Poor thing! Yazıq! Zavallı!* **dumb ~s** dilsiz-ağızsız heyvanlar; **6.** lüzumlu / münasib şey; *It is just the thing Bu elə mən deyəndir;*
◊ *The main thing is ... Başlıcası budur ki, ...;* **the same ~** eyni şey; *It comes to the same thing Fərqi yoxdur, Hamısı birdir*
**think** [θɪŋk] *v* **(about, of)** **1.** düşünmək, fikirləşmək; **to ~ logically** məntiqi düşünmək; **2.** düşünüb / fikirləşib tapmaq; **the ability to ~** düşünmək qabiliyyəti; *Who would have thought of it? Bu kimin ağlına gələrdi?* **3.** hesab etmək; güman / zənn etmək; *So you think it can't be done Deməli, sən / siz hesab edirsən / edirsiniz ki, bu, mümkün deyil; People will think you're crazy Camaat elə bilər (ki) dəlisən / dəlisiniz;* **4.** başa düşmək; təsəvvür etmək; *I can't think where he might be Təsəvvür edə bilmirəm ki, o harada ola bilər;* **5.** gözləmək; təxmin / zənn etmək, fikrində tutmaq; *I thought as much Mən elə belə də gözləyirdim;* **6.** yada salmaq, xatırlamaq; *I can't think of her name Onun adını yadıma sala bilmirəm;* **7.** daima fikirləşmək; xəyal etmək; **8.** fikrində tutmaq; *Think of a number / figure Fikrində / Fikrinizdə bir rəqəm tut / tutun;* **9.** uydurmaq, fikirləşib tapmaq; *What will he*

*think of next? O sonra nə uyduracaq?* **to ~ out / through** ölçüb-biçmək, ətraflı fikirləşmək; **to ~ over** düşünmək, götür-qoy etmək;
◊ **to ~ much of** özündən bədgüman olmaq; **to ~ no end of** *smb.* bir kəsi çox yüksək qiymətləndirmək; **to ~ better of** *smb.* bir kəs haqqında yaxşı fikirdə olmaq; **to ~ twice** hərtərəfli götür-qoy etmək / fikirləşmək

**thinkable** [ˈθɪŋkəbl] *adj* mümkün olan, ağlasığan

**thinker** [ˈθɪŋkə^r] *n* mütəfəkkir

**thinking**[1] [ˈθɪŋkɪŋ] *n* **1.** təfəkkür, düşüncə, şüur; **way of ~** təfəkkür / düşüncə tərzi; **revolution in ~** şüurda inqilab; **2.** rəy, fikir; **to my way of ~** məncə, mənim fikrimcə; *I brought him round to my way of thinking Mən onu öz fikrimlə razılaşdırdım*

**thinking**[2] [ˈθɪŋkɪŋ] *adj* fikirləşən, düşünən; **all ~ people** bütün düşünən insanlar

**think piece** [ˈθɪŋkˈpi:s] *n d.d.* icmal məqaləsi

**thinly** [ˈθɪnlɪ] *adv* **1.** nazik; **~ sliced bread** nazik doğranmış çörək; **2.** incə, incəliklə; **3.** seyrək; **to sow the seeds ~** toxumu seyrək səpmək; **~ populated area** əhalisi seyrək olan ərazi; **4.** çətinliklə, güclə; **~ veiled threat** güclə gizlədilən hədə-qorxu

**thin-skinned** [ˈθɪnˈskɪnd] *adj* **1.** nazikqabıq (*meyvə haq.*); **2.** küsəyən, dəymədüşər

**third**[1] [θə:d] *n* **1.** üçdə bir hissə; **2.** *mus.* tersiya

**third**[2] [θə:d] *num* üçüncü; **the ~ person** üçüncü şəxs; **the ~ month of the year** ilin üçüncü ayı

**third-rate** [ˈθə:dˈreɪt] *adj* bekara, pis; üçüncü dərəcəli / növ / sort

**thirst**[1] [θə:st] *n* **1.** susuzluq; **to experience ~** susuzluq çəkmək; **to quench ~** susuzluğu yatırmaq; **2.** *məc.* coşğun həvəs; **a ~ for knowledge** bilik qazanmaq həvəsi

**thirst**[2] [θə:st] *v* **1.** susamaq, susuzluqdan yanmaq; **2.** *məc.* çox arzu etmək / istəmək

**thirsty** [ˈθə:stɪ] *adj* **1.** susayan, susuzluq hiss edən; *Some kinds of food make one thirsty Bəzi yeməklər adamı susadır;* **2.** *məc.* ehtirasla arzu edən, həsrətində olan; **~ for power** hakimiyyət həsrətində olan; **3.** quru, susuz (*torpaq haq.*); **~ fields** susuz / quru çöllər

**thirteen** [ˈθə:ˈti:n] *num.* on üç

**thirties** [ˈθə:tɪz] *n pl* **1.** (**the ~**) otuzuncu illər; **2.** yaş (*30 və 39 arası*); *She is just out of her thirties O təzəcə qırx yaşına keçib*

**thirtieth** [ˈθə:ti:θ] *num.* otuzuncu; **the ~ row** otuzuncu cərgə / sıra

**thirty** [ˈθə:tɪ] *num.* otuz; *He is over thirty Onun yaşı otuzdan çoxdur*

**this** [ðɪs] *demon. pron* bu; **~ house** bu ev; **~ time last year** keçən il bu vaxtı; **~ new watch of mine** mənim bu təzə saatım; *This will never do Bu heç cürə yaramaz;* **to talk about ~ and that** ordan-burdan danışmaq; **like ~** belə, beləliklə

**thistle** [ˈθɪsl] *n bot.* qanqal

**thistle-down** [ˈθɪsldaun] *n* qanqal toxumlarının tiftiyi; tiftik, zərif tük;
◊ **as light as ~** pərqu kimi yüngül

**thistly** [ˈθɪslɪ] *adj* **1.** qanqallı; **2.** tikanlı

**thither** [ˈðɪðə^r] *adv d.d.* ora, oraya; o tərəfə; **hither and ~** ora bura; o tərəfə, bu tərəfə

**thitherto** [ˈðɪðəˈtu:] *adv d.d.* o vaxta kimi / qədər, o vaxtacan

**thole** [θoul] *n* avar yeri (*qayıqda*)

**thole-pin** [ˈθoulpɪn] *n* = **thole**

**thong**[1] [θɔŋ] *n* **1.** qayış, kəmər; **2.** şallaq, qamçı

**thong**[2] [θɔŋ] *v* qamçılamaq, şallaqlamaq

**thoraric** [ˈθɔ:rærɪk] *adj anat.* döş, sinə

**thorax** [ˈθɔ:ræks] *n anat.* döş qəfəsi

**thorn** [θɔ:n] *n* **1.** tikan; **to remove a ~ from** *one's* **finger** barmağından tikan çıxartmaq; **2.** tikanlı bitki;
◊ **a ~ in** *smb.'s* **side / flesh** bir kəsin başının daşı, bir kəsə daim mane olan şey

**thorn-apple** [ˈθɔ:n,æpl] *n bot.* **1.** dəlibəng; **2.** *məc.* zəhər, tiryək

**thorny** [ˈθɔ:nɪ] *adj* **1.** tikanlı; **a ~ bush / tree** tikanlı kol / ağac; **2.** çətin; **~ path** çətin yol; **3.** ziddiyyətli, mübahisəli; **a ~ question** mübahisəli məsələ; **4.** incə, nazik; **a ~ issue** incə məsələ

**thorough** [ˈθʌrə] *adj* **1.** tam, başa çatdırılmış; **a ~ investigation** tam / başa çatdırılmış istintaq; **2.** mükəmməl, dəqiq; **a ~ analysis** mükəmməl / dəqiq təhlil;





**3.** əsaslı; **a ~ search** əsaslı tədqiqat; **4.** bitkin, kamil, əsl; **~ knowledge of a subject** fənni kamil bilmə; **a ~ gentleman** əsl centlmen

**thoroughbred**[1] [ˈθʌrəbred] *n* **1.** cins heyvan; **2.** yaxşı tərbiyə görmüş əsilzadə adam; **3.** ən yaxşı avtomobil / velosiped

**thoroughbred**[2] [ˈθʌrəbred] *adj* **1.** cins, safqanlı (*heyvan haq.*); **2.** nəcabətli; kübar; **3.** eyibsiz, nöqsansız

**thoroughfare** [ˈθʌrəfeə^r] *n* **1.** əsas magistral; mühüm nəqliyyat yolu; **2.** keçid, yol; *No thoroughfare Yol bağlıdır (maşınlar üçün)*

**thoroughgoing** [ˈθʌrə,gɔɪŋ] *adj* **1.** cəsarətli, qətiyyətli; güzəştsiz; **2.** qəti, köklü

**thoroughly** [ˈθʌrəlɪ] *adv* **1.** tamamilə, tam; bütün, bütünlüklə; **2.** ciddi şəkildə; axıradək

**thoroughness** [ˈθʌrənɪs] *n* **1.** əsaslılıq, tutarlılıq; **2.** mükəmməllik; müfəssəllik

**those** [ðouz] onlar, o; **~ buildings** o binalar

**though**[1] [ðou] *adv* bununla belə, lakin, ancaq, yenə də; buna baxmayaraq; hər halda; *Do as you like, though Ancaq özün / özünüz necə bilirsən / bilirsiniz, elə də et / edin; I must leave; I'll be back, though Mən getməliyəm; hərçənd ki, qayıdacağam*

**though**[2] [ðou] *conj* **1.** baxmayaraq, əgərçi; *I am against the resolution, though I admit that... Baxmayaraq ki, mən qətnamənin əleyhinəyəm, amma etiraf etməliyəm ki, ...;* **2.** hərçənd, -sa / -sə də; *Our house, though small, is very cosy Bizim evimiz, hərçənd balacadır, çox rahatdır; Though it rained, we went Yağış yağsa da, biz getdik;* **3.** hətta, ...da, ...də; əgər; *Though you may fail, you will have to try Hətta məğlub olsan / olsanız da, sən / siz cəhd göstərməli olacaqsan / olacaqsınız;* **strange ~ it may seem...** qəribə də olsa,...; **as ~** elə bil, sanki, guya, guya ki, elə bil ki; *He is hesitating, as though he were afraid O tərəddüd edir, elə bil ki / sanki qorxur*

**thought**[1] [θɔ:t] *n* **1.** fikir, düşüncə; **to collect** *one's* **~s** fikrini toplamaq / cəmləşdirmək; **lost in ~** fikrə dalmış / qərq olmuş; **to read** *smb.'s* **~** bir kəsin fikrini oxumaq; **to take ~** düşünmək, fikrə getmək; **2.** niyyət, məram, məqsəd; **3.** qayğı, diqqət; **to take / to show ~ for** *smb.* bir kəsin qayğısına qalmaq; **4.** xəyalat, düşüncə; **to give ~ to** ətraflı düşünmək, götür-qoy etmək;
◊ *Second thoughts are best at. söz. ≡ Yüz ölç, bir biç*

**thought**[2] [θɔ:t] **to think** *felinin pt, pp formaları*

**thoughtful** [ˈθɔ:tfl] *adj* **1.** fikirli, dalğın; **a ~ look** dalğın / fikirli baxış; **2.** məzmunlu, dolğun (*kitab və s. haq.*); **a ~ book** məzmunlu kitab; **3.** diqqətli, qayğıkeş

**thoughtfulness** [ˈθɔ:tfulnɪs] *n* qayğıkeşlik, qayğı; diqqət, iltifat

**thoughtless** [ˈθɔ:tlɪs] *adj* **1.** düşünülməmiş; **2.** səhlənkar; **3.** diqqətsiz; hörmətsiz

**thoughtlessness** [ˈθɔ:tlɪsnɪs] *n* **1.** düşüncəsizlik; düşünülməmiş hərəkət; **2.** diqqətsizlik, laqeydlik

**thought-out** [ˈθɔ:tˈaut] *adj* ətraflı düşünülmüş; **a well ~ argument** ətraflı düşünülmüş dəlil

**thousand** [ˈθauzənd] *num.* min; **a ~ times easier** min dəfə asan; *He made a thousand and one excuses O min dəfə üzr istədi*

**thousandfold** [ˈθauzəndfould] *adj* min dəfə böyük, minqat

**thousandth** [ˈθauzəntθ] *num.* mininci

**thrall**[1] [θrɔ:l] *n* **1.** qul, kölə, əsir; **2.** *məc.* qul olma; *He is in the thrall to his passions O, ehtiraslarının quludur / əsiridir*

**thrall**[2] [θrɔ:l] *v tar.* qul etmək, kölə halına salmaq

**thrash** [θræʃ] *v* **1.** döymək (*çubuqla*), vurmaq; **2.** qalib gəlmək, udmaq (*döyüşdə, yarışda və s.*); **3.** döymək (*taxıl*); **to ~ about 1)** kəskin hərəkət etmək; şappıldatmaq; **2)** çapalamaq; vurnuxmaq (*xəstə haq.*); **to ~ (about) in the bed with high fever** yüksək qızdırmadan yataqda çapalamaq; **to ~ out** müfəssəl müzakirə etmək; **to ~ a subject / conclusions** məsələni / nəticələri müfəssəl müzakirə etmək; **to ~ over** intəhasız / dəfələrlə müzakirə etmək

**thrashel** [ˈθræʃəl] *n k.t.* zəncir

**thrasher** [ˈθræʃə^r] *n* **1.** kötəkləyən, vuran; cəza verən; **2.** taxıldöyən, xırmançı

**thrashing** [ˈθræʃɪŋ] *n* kötək; döymə, döyülmə (*çubuqla*); **to give *smb.* a sound ~** bir kəsi lazımınca əzişdirmək

**thrashing-floor** [ˈθræʃɪŋflɔ:] *n k.t.* **1.** xırman, xırman meydançası; **2.** anbar

**thrashing-machine** [ˈθræʃɪŋmə,ʃi:n] *n k.t.* taxıldöyən maşın

**thraso** [ˈθreɪsou] *n* lovğa, özünü öyən (*adam*)

**thread**[1] [θred] *n* **1.** sap; **sewing ~** tikiş sapı; **strong ~** möhkəm sap; **2.** tor; toxuma, naxış; **~s of a cobweb** hörümçək toru; **3.** tel; **grey ~s of hair** ağaran saçlar, gümüşü tellər; **a ~ of light** işıq şüası; **4.** *məc.* əlaqə, bağ; **to lose the ~ of *smth.*** bir şeylə əlaqəni itirmək; **5.** *tex.* çərtmə; yiv; **6.** *tex.* tel, məftil, sim;
◊ **the ~ of life** ömür yolu, həyat; **~ and thrum** hamısı birlikdə; **to hang by / on a ~** tükdən / sapdan asılı olmaq; **worn to the last ~** köhnəlmiş, dağılmış; *I haven't a thread fit to wear Geyinməyə heç nəyim yoxdur*

**thread**[2] [θred] *adj* sapdan toxunmuş, toxunma; **~ gloves / stockings** toxunma əlcək / corab

**thread**[3] [θred] *v* **1.** saplamaq, iynə saplamaq; *Thread a needle for me Mənə bir iynə sapla / saplayın*; **2.** düzmək, sapa düzmək (*muncuğu və s.*); **3.** yol çəkmək / salmaq; yol açmaq; **to ~ *one's* way through the crowd** izdihamın arasından özünə yol açmaq; **4.** …keçmək; qırmızı xətlə keçmək (*yazılmaq*); **5.** saplamaq, hazırlamaq (*toxucu dəzgahını, tikiş maşınını və s.*); **to ~ a film into the camera** filmi kameraya salmaq; **6.** *tex.* yiv açmaq; çərtmək; **7.** hörmək, toxumaq

**threadbare** [ˈθredbeəʳ] *adj* **1.** dağılmış, köhnə, köhnəlmiş (*paltar haq.*); **~ clothes** geyilmiş / nimdaş paltar; **a ~ carpet** sürtülmüş / dağılmış xalça; **2.** *məc.* bayağı, köhnəlmiş, çeynənmiş; **a ~ argument** bayağı dəlil; **a ~ joke** bayağı zarafat; **a ~ theme** çeynənmiş mövzu; **a ~ story** köhnə əhvalat

**threaded** [ˈθredɪd] *adj* **1.** sapdan toxunmuş; **2.** *tex.* yivli, xırlı

**threader** [ˈθredəʳ] *n* **1.** vintaçan, yivaçan; **2.** dəzgah fəhləsi

**threadlike** [ˈθredlaɪk] *adj* **1.** sapaoxşar, sap kimi; **2.** lifli, tel-tel

**thready** [ˈθredɪ] *adj* **1.** sapdan toxunmuş; sapaoxşar; **~ worms / roots** sapaoxşar qurdlar / köklər; **2.** tel-tel; **3.** incə, zərif (*səs haq.*); **4.** yapışan, qatı

**threat** [θret] *n* hədə, qorxu, təhlükə; **the ~ of war** müharibə təhlükəsi; **a ~ to peace** sülhə təhlükə; *He is always making threats O həmişə hədə-qorxu gəlir;* **to use / to utter ~s against *smb.*** bir kəsi hədələmək; **to pose a ~ to cause of peace** sülh işinə təhlükə yaratmaq

**threaten** [ˈθretn] *v* (**with**) hədələmək, qorxutmaq; **to ~ with punishment** cəza ilə hədələmək; **to ~ *smb.* with *one's* fist** bir kəsi yumruqla hədələmək; *Do you mean to threaten? Olmaya məni hədələyirsən / hədələyirsiniz?*

**threatening** [ˈθretnɪŋ] *adj* **1.** qorxuducu, hədələyici; qorxulu, təhlükəli; **a ~ gesture** hədələyici əl-qol hərəkəti; **2.** hədələyən, təhlükə yaradan

**three** [θri:] *num.* üç; **~ times** üç dəfə üç; **in ~s** üç-üç; **to come in ~s** içəri üç-üç gəlmək

**three-coloured** [ˈθri:ˈkʌləd] *adj* üçrəngli; **~ banner** üçrəngli bayraq

**three-cornered** [ˈθri:ˈkɔ:nəd] *adj* **1.** üçkünc; **a ~ hat** üçkünc şlyapa; **2.** üçtərəfli **3.** *məc.* yöndəmsiz, biçimsiz

**three-decker** [ˈθri:ˈdekəʳ] *n* **1.** üçgöyərtəli gəmi; **2.** *məc.* trilogiya, üçcildlik roman; **3.** üçlaylı sandviç

**three-dimensional** [ˈθri:dɪˈmenʃənl] *adj* **1.** üçölçülü); **2.** stereoskopik

**three-field** [ˈθri:fi:ld] *adj k.t.* üçtarlalı; **~ system** üçtarlalı əkin sistemi

**threefold** [ˈθri:fould] *adj* **1.** üçhissəli; üç cür; **2.** üçqat artıq, üç dəfə böyük; **3.** üç dəfə (olan); **a ~ increase** üç dəfə artım / çoxalma

**three-legged** [ˈθri:ˈlegd] *adj* üçayaqlı, üçqıçlı; **a ~ table** üçayaqlı stol

**three-master** [ˈθri:ˈma:stəʳ] *n* üçdorlu gəmi

**three-phase** [ˈθri:feɪz] *adj el.* üçfazalı

**three-room** [ˈθri:ˈru:m] *adj* üçotaqlı; **a ~ flat** üçotaqlı mənzil

**three-sided** [ˈθri:ˈsaɪdɪd] *adj* üçtərəfli; üçyanlı





**threesome**[1] [ˈθri:səm] *n* üçlük; üç nəfər

**threesome**[2] [ˈθri:səm] *adj* üç nəfərdən ibarət

**three-storey** [ˈθri:ˈstɔ:rɪ] *adj* üçmərtəbəli; **a ~ building** üçmərtəbəli bina

**three-story** [ˈθri:ˈstɔ:rɪ] *adj amer.* = **three-storey**

**three-time** [ˈθri:ˈtaɪm] *adj* üç dəfə; **~ champion** üç dəfə çempion

**three-way** [ˈθri:weɪ] *adj* **1.** *tex.* üçhərəkətli; **2.** üçtərəfli; **~ exchange** üçtərəfli mübadilə

**three-wheel** [ˈθri:ˈwi:l] *adj* üççarxlı, üçtəkərli

**thremmatology** [,θreməˈtɔlədʒɪ] *n* tremmatologiya

**threnody** [ˈθrenədɪ] *n* matəm mahnısı

**thresh** [θreʃ] *v k.t.* döymək (*taxıl*)

**thresher** [ˈθreʃəʳ] *n* **1.** *k.t.* taxıldöyən, xırmançı; **2.** taxıldöyən (*maşın*); **3.** *zool.* dəniz tülküsü

**threshing** [ˈθreʃɪŋ] *n* **1.** taxıl döymə; **2.** xırman vaxtı

**threshing-floor** [ˈθreʃɪŋflɔ:ʳ] *n k.t.* xırman, xırman meydançası

**threshing-machine** [ˈθreʃɪŋmə,ʃi:n] *n k.t.* taxıldöyən maşın

**threshold** [ˈθreʃhould] *n* **1.** kandar, astana; **to cross the ~** kandarı keçmək, içəri girmək; **2.** *məc.* başlanğıc; **at the ~ of a new era** yeni dövrün başlanğıcında; **~ of a new career** yeni karyeranın başlanğıcı; **3.** *psix.* hədd, sərhəd; **~ of consciousness** düşüncə həddi; **~ of sensitivity** həssaslıq həddi

**threw** [θru:] **to throw** *felinin pt forması*

**thrice** [θraɪs] *adv* üç dəfə, üç kərə; **to knock ~** üç dəfə döymək (*qapını*)

**thrift** [θrɪft] *n* **1.** qənaət; ehtiyatlılıq; sərhesablıq; faydalılıq; **to practice ~** qənaət etmək; **2.** *amer.* çiçəklənmə, tərəqqi, inkişaf; firavan həyat

**thriftbox** [ˈθrɪftbɔks] *n* daxil, pul daxılı

**thriftless** [ˈθrɪftlɪs] *adj* **1.** israfçı, bədxərc; **2.** sərfəsiz

**thriftshop** [ˈθrɪftʃɔp] *n* köhnə paltar və işlənmiş mallar dükanı

**thrifty** [ˈθrɪftɪ] *adj* **1.** qənaətcil, yığımcıl; ehtiyatlı; **~ housewife** qənaətcil evdar qadın; **2.** *amer.* çiçəklənən, firavan / şən həyat keçirən

**thrill**[1] [θrɪl] *n* **1.** həyəcan; həvəs; *My first airplane ride was a real thrill Mənim təyyarə ilə ilk uçuşum əsl həyəcan idi;* **2.** titrəmə, əsmə; **3.** titrəyiş, tərpənmə

**thrill**[2] [θrɪl] *v* **1.** həyəcanlandırmaq, həvəsləndirmək; *The film thrilled the audience Film tamaşaçıları həyəcanlandırdı;* **2.** əsmək, titrəmək (*qorxudan, sevincdən və s.*); *My heart thrilled with joy Ürəyim sevincdən əsdi;* **3.** məftun / valeh etmək, çox maraqlandırmaq; *We were thrilled to hear the news Xəbərlər bizi çox maraqlandırdı;* **to ~ the audience** tamaşaçıları valeh / heyran etmək; **4.** əsmək; titrətmək, əsdirmək; **to ~ the land** yeri titrətmək

**thrilled** [ˈθrɪld] *adj* **1.** həyəcanlı; tələşlı, həraətli; **2.** maraqlı, maraqlandırılmış

**thriller** [ˈθrɪləʳ] *n* oxucunu / tamaşaçını maraqlandıran fövqəladə / sensasiyalı kitab / kino / veriliş / reportaj; **~ about international terrorism** beynəlxalq terrorizm haqqında sensasion reportaj

**thrilling** [ˈθrɪlɪŋ] *adj* **1.** valehedici, məftunedici; təsirli; maraqlı; **a ~ detective** maraqlı detektiv; **2.** titrək, titrəyən, əsən

**thrive** [θraɪv] *v* **1.** çiçəklənmək, inkişaf etmək; *The business is thriving Biznes inkişaf edir;* **2.** xoşbəxt / firavan yaşamaq; *He is thriving O, firavan yaşayır;* **3.** artmaq, qol-budaq atmaq; *Plants thrive under her care Bitkilər onun qayğısı sayəsində artır;* **4.** xoşuna gəlmək; *He thrives on hard work Ağır iş onun xoşuna gəlir*

**throat**[1] [θrout] *n* **1.** boğaz; hülqum, xirtdək; **to clear *one's* ~** boğazını arıtmaq; **to be full to the ~** canı boğazına yığılmaq; **to stick in *one's* ~** boğazında qalmaq (*sümük, çəyirdək və s.*); **2.** dar yol, keçid; deşik; **the ~ of a bottle** butulkanın boğazı; **3.** *tex.* ağız, boğazlıq;
◊ **to cut *one's* own ~** özünə quyu qazmaq; **to jump down someone's ~** bir kəsi susdurmaq; **to cut one another's ~** qatı düşmənçilik etmək; **to give *smb.* the lie in his ~** bir kəsin ağ yalanını ifşa etmək; **to thrust / to cram *smth.* down *smb.'s* ~** bir şeyi bir kəsin zorla boynuna qoymaq

**throat**[2] [θrout] *v* **1.** mırıldamaq, öz-özünə / burnunun altında danışmaq; **2.** xırıltılı səslə / pəsdən oxumaq, zümzümə etmək

**throaty** [ˈθrouti] *adj* **1.** xırıltılı, tutqun; **2.** boğazdan / qırtlaqdan çıxan (*səs*)

**throb[1]** [θrɔb] *n* **1.** titrəmə, həyəcan; **2.** vurma (*nəbzdə, qan damarında*), döyüntü (*ürəkdə*); **3.** *mus.* titrəmə, titrəyiş

**throb[2]** [θrɔb] *v* (**-bb-**) **1.** *tib.* vurmaq (*qan damarı, nəbz*), döyünmək (*ürək*); **2.** titrəmək; *My temples are throbbing Başım bərk ağrıyır*; **3.** *məc.* lərzəyə gəlmək / düşmək

**throe** [θrou] *n pl tib.* **1.** dəhşətli ağrı, əziyyət; işgəncə; **the ~s of childbirth** doğuş ağrıları; **2.** can vermə; **~s of death** can vermə, ölümqabağı ağrılar

**thrombosis** [θrɔmˈbousıs] *n tib.* tromboz; **coronary** ~ vena damarının trombozu; infarkt; **aortic** ~ aortanın stenozu / daralması; **jumping** ~ hərəkət edən tromboz

**thrombus** [ˈθrɔmbəs] *n tib.* tromb

**throne[1]** [θroun] *n* **1.** taxt, taxt-tac; **2.** (**the** ~) kral, hakimiyyət; **3.** yüksək mövqe / yer

**throne[2]** [θroun] *adj* taxt-tac; **a ~ room** taxt-tac salonu

**throne[3]** [θroun] *v* **1.** taxta oturtmaq / çıxartmaq; **2.** böyük mövqe tutmaq

**throng[1]** [θrɔŋ] *n* **1.** dəstə, izdiham, camaat; **2.** kütlə; çoxluq

**throng[2]** [θrɔŋ] *v* **1.** yığışmaq, toplaşmaq; *People thronged the square Camaat meydana toplaşdı*; **2.** ağzınacan doldurmaq (*evi, binanı, yeri və s.*)

**throstle** [ˈθrɔsl] *n zool.* oxuyan qaratoyuq

**throttle** [ˈθrɔtl] *v* **1.** boğmaq; **to ~ freedom** azadlığı boğmaq; **2.** *tex.* sıxışdırmaq, söndürmək; **to ~ an engine** mühərriki söndürmək; **to ~ down** qazı / sürəti azaltmaq

**through[1]** [θru:] *adj* **1.** birbaşa, düz; **~ service** birbaşa əlaqə; **~ train** birbaşa (gedən) qatar; **~ flight** birbaşa uçuş; **2.** maneəsiz, sərbəst; **~ passage** sərbəst keçid; **to be ~** qurtarmaq; *Aren't you through yet? Hələ qurtarmamısan / qurtarmamısınız? I am through with her Mən onunla əlaqəni kəsmişəm*

**through[2]** [θru:] *adv* **1.** başdan-ayağa qədər, tamam; *We got wet / soaked through Biz tamam islandıq*; **to sing a song ~** mahnını axıra kimi oxumaq; **to carry ~** başa çatdırmaq / vurmaq, tamamlamaq; *I will go through with it, whatever happens Nəyin bahasına olursa olsun, mən bu işi başa çatdıracağam*; **to put a person ~** bir adamı calaşdırmaq (*telefonda*); *You are through! Danış! Danışın!*; **2.** fasiləsiz, aramsız, bütün, başdan-başa

**through[3]** [θru:] *prep.* **1.** ...içindən, ...arasından; -dan, -dən; **to go ~ a tunnel** tuneldən / tunelin içərisindən keçmək; **to make *one's* way ~ a crowd** yarıb izdihamın arasından keçmək; **to breathe ~ *one's* mouth** ağızdan nəfəs almaq; **to look ~ a telescope** teleskopdan baxmaq; **a path ~ the forest** meşədən keçən yol / cığır; **to speak ~ *one's* nose** burnunda danışmaq, mızıldamaq; **to go ~ many trials** çox sınaqlardan keçmək; **2.** ...ilə, -la, -lə; **to walk ~ the mud** palçıqlıqla getmək; **3.** -da, -də; **to fly ~ the air** havada uçmaq; **4.** -ı, -i; **to travel ~ France** Fransanı dolaşmaq / gəzmək; **to walk ~ the streets** küçələri dolaşmaq / gəzmək; **5.** ...üzündən, ... görə; -dan, -dən; nəticəsində; ucbatından; **~ no fault of mine** mənim səhvim üzündən olmayan; **~ ignorance** nadanlıq ucbatından; **6.** -dək; **from May ~ September** may ayından sentyabradək; *I'm staying through Sunday Bazar gününədək burada olacağam*; **7.** ...müddətində, ...ərzində; **all ~ dinner** nahar müddətində; **all ~ the night** bütün gecəni, səhərə kimi; **8.** vasitəsilə, ilə; **to speak ~ an interpreter** tərcüməçi vasitəsilə danışmaq; *We learned the news through friends Biz xəbəri dostlardan öyrəndik*; **9.** ...yolu ilə, ...köməyi ilə; **to achieve *one's* goals ~ revolution** məqsədlərinə inqilab yolu ilə nail olmaq; **10.** əvvəldən axıradək, bütün; *We stayed in Milan through the summer Biz bütün yayı Milanda qaldıq*; **to look ~** nəzərdən / gözdən keçirmək; **to look ~ a report** məruzəni nəzərdən keçirmək; **to go ~ a red light** qırmızı işıqda getmək / keçmək; **to pass ~ three stages of development** üç inkişaf mərhələsi keçmək; **to leaf ~ a book** kitabı vərəqləmək

**throughout[1]** [θruˈaut] *adv* **1.** hər yerdə / yanda / tərəfdə; **2.** hər cəhətdən; başdan-başa; *The house is furnished throughout*





*Ev tamam / başdan-başa avadanlıqla döşənmişdi*; **3.** əvvəldən axıra(dək); *The dictionary has been revised throughout Lüğət əvvəldən axıradək yenidən işlənmişdir*

**throughout[2]** [θruˈaut] *prep.* bütün, hər; ərzində, müddətində; *The fire spread throughout the barn Yanğın bütün anbarı bürüdü*; **~ the country** ölkənin hər yerində; **~ the war** müharibə müddətində; **~ the 19th century** XIX əsr boyu / ərzində

**throw[1]** [θrou] *n* **1.** atma, tullama, atış; **at a single ~** bir atışla / zərbə ilə; **2.** *id.* tullama, atma (*güləşdə*); **~ in circle flying overhead** başı üzərindən fırladıb atma; **~ from standing position** yerində dayanıb atma; **discus ~** disk atma; *It's your throw Atma sənin / sizin növbəndir / növbənizdir*; **3.** *id.* səhv zərbə (*badminton oyununda*); **4.** *id.* tullama / atma məsafəsi; sıçrayış; **5.** örtük (*çarpayının*); **6.** *amer., d.d.* dənə, ədəd; **to sell *smth.* at four dollars a ~** bir dənəsini dörd dollara satmaq

**throw[2]** [θrou] *v* **1.** atmaq, tullamaq; **to ~ the ball to someone** topu bir kəsə atmaq; **to ~ stones at someone** bir kəsə daş atmaq; **to ~ snowballs at each other** bir-birinə qartopu atmaq; **to ~ a stone through the window** pəncərəyə daş atmaq; **to ~ *smth.* out of the window** bir şeyi pəncərədən atmaq; **to ~ oneself at someone's arms** özünü bir kəsin ağuşuna atmaq; **2.** atılmaq, üstünə tullanmaq, şığımaq; **to ~ oneself at *smb.* / *smth.*** bir kəsin / bir şeyin üstünə şığımaq / atılmaq; **to ~ a glance** nəzər salmaq; **3.** salmaq, düşürmək (*atdan*); **4.** qabıq qoymaq, dəyişmək (*ilan*); **5.** atmaq, salmaq, örtmək; **to ~ a shawl over *one's* shoulders** çiyninə şal salmaq; **6.** salmaq (*müəyyən hala*); **to ~ into confusion** vəlvələyə / çaxnaşmaya salmaq; **7.** balalamaq, doğmaq, buzovlamaq; **8.** əyirmək; burmaq; **9.** *id.* kürəyini yerə vurmaq (*güləşdə*); **10.** *d.d.* düzəltmək, təşkil etmək (*qonaqlıq, əyləncə gecəsi*); vermək (*qonaqlıq və s.*); **11.** *id.* bilərəkdən uduzmaq (*yarışda, oyunda və s.*); **12.** qurmaq, salmaq (*körpü*); **13.** *məc.* salmaq, atmaq; **to ~ *smb.* into jail** bir kəsi zindana atmaq / salmaq; **14.** *məc.* yıxmaq, atmaq; **to ~ the blame on *smb.*** günahı bir kəsin üstünə atmaq / yıxmaq; **to ~ light on *smth.*** bir şeyi aydınlaşdırmaq; **to ~ suspision on *smth.*** bir şeyi şübhə altına almaq; **to ~ about** səpələmək, havaya sovurmaq (*pulu*); **to ~ aside** kənara atmaq / tullamaq; **to ~ away 1**) atmaq, kənara atmaq; **2**) boş yerə sərf etmək (*pulu, sərmayəni*); **3**) buraxmaq, qaçırtmaq (*əlindən*); əldən vermək; **to ~ away an advantage** fürsəti əldən vermək; **to ~ back** geriyə atmaq, geriyə əymək; **to ~ back *one's* head** başını geriyə əymək; **to ~ down** aşağı salmaq; çıxartmaq (*paltarı*); **to ~ oneself down** yerə sərilmək; **to ~ down *one's* tools 1**) tətil etmək; **2**) dağıtmaq, uçurtmaq (*bina, ev və s.*); **3**) rədd etmək (*təklifi, təşəbbüsü və s.*); **to ~ in** əlavə / daxil etmək; **to ~ off 1**) rədd etmək; **2**) kənara tullamaq, çıxartmaq; **to ~ *smb.* off balance** bir kəsi hövsələdən çıxartmaq; **to ~ off an illness** xəstəlikdən sağalmaq; **to ~ on 1**) çiyninə atmaq; geyinmək (*palto, paltar*); **2**) atmaq (*odun, kömür və s.*); **to ~ on coals** kömür atmaq (*ocağa, sobaya və s.*); **to ~ out 1**) bayıra tullamaq / atmaq; **2**) çıxartmaq (*qulluqdan, vəzifədən*); **3**) buraxmaq, saçmaq (*şüa, işıq, isti və s.*); **4**) *hüq.* rədd etmək, qaytarmaq (*qanun layihəsini*); **5**) dolaşdırmaq, çaşdırmaq, çaşmaq (*hesablamada*); **6**) *hərb.* çıxarmaq, çıxartmaq; **7**) *id.* ötmək, geridə buraxmaq; **8**) yanında tikmək, tikib əlavə etmək; **to ~ out a new wing** yeni cinah tikib əlavə etmək (*binaya*); **to ~ over 1**) atmaq, tərk etmək (*dostları*); **2**) rədd / imtina etmək, razılıq verməmək; **3**) *tex.* dəyişdirmək; **to ~ together 1**) tələsik tərtib etmək, kompilyasiya etmək; **2**) bir yerə yığmaq, toplamaq (*adamları, camaatı*); **to ~ up 1**) atmaq; **2**) nəzər salmaq, qaldırmaq (*əlləri*); **3**) tez tikmək, qurmaq (*ev, barrikada*); **4**) nəzərə çarpdırmaq; **5**) iştirakdan imtina etmək; **6**) *amer.* irad tutmaq; **7**) püskürmək; ◊ **to ~ the great cast** qəti addım atmaq; **to ~ a fit** qəzəblənmək, qeyzlənmək; **to ~ oneself at the head of *smb.*** *d.d.* bir kəsin boğazından asılmaq; **to ~ the cap over the mill** pis yola düşmək

**throwaway**[1] [ˈθrouə,weı] *n* reklam vərəqi; buklet
**throwaway**[2] [ˈθrouə,weı] *adj* yararsız, dəyərsiz; birdəfəlik; **a ~ bottle / package** birdəfəlik butulka / paket
**throw-back** [ˈθroubæk] *n* **1.** tənəzzül, geriləmə, ləngimə; **2.** *biol.* atavizm; *The youngest son was a throw-back to his ancestors Ən balaca oğulda ulu babaların əlamətləri vardı*
**thrower** [ˈθrouəʳ] *n* **1.** atan, tullayan; qumbaraatan, bombaatan (*əsgər*); **discus ~** diskobol; **2.** dulusçu; **3.** atıcı / tullayıcı aparat
**throw-in** [ˈθrouˈın] *n id.* oyuna daxil etmə (*topu, şaybanı*)
**thrown** [θroun] **to throw** *felinin pp forması*
**thrown silk** [ˈθrounˈsılk] *n* eşilmiş / burulmuş ipək
**throw-off** [ˈθrouˈɔf] *n* başlanğıc, əvvəl (*ovda, qaçışda*)
**throw-out** [ˈθrouˈaut] *n d.d.* tullantı, zibil
**throwster** [ˈθroustəʳ] *n toxuc.* ipək eşən / buran (*işçi*)
**thrum**[1] [θrʌm] *n toxuc.* **1.** ucu burulmamış sap; **2.** saçaq; **3.** cingilti; danqıltı
**thrum**[2] [θrʌm] *v* **1.** cingildətmək; **2.** barmaqları ilə taqqıldatmaq
**thrust**[1] [θrʌst] *n* **1.** təkan; itələmə; **2.** zərbə; hücum; **3.** kəskin çıxış (*əleyhinə*); **4.** silahlı hücum; **5.** *tex.* dayaq, dirək, söykənəcək, istinad
**thrust**[2] [θrʌst] *v* **1.** itələmək; **2.** sancmaq, deşmək; **3.** soxmaq, qoymaq; **to ~ *one's* hands into *one's* pockets** əllərini ciblərinə soxmaq; **4.** soxulmaq, girmək, itələyə-itələyə soxulmaq; **to ~ *one's* way** itələyə-itələyə özünə yol açmaq; **to ~ oneself into a well-paid position** yaxşı maaşlı vəzifəyə soxulmaq; **5.** zorla boynuna qoymaq / qəbul etdirmək; **to ~ aside** kənara itələmək, bir kənara tullamaq; **to ~ forth** itələyib / vurub çıxartmaq; **to ~ in** sancmaq, batırmaq, əlavə etmək; **to ~ in a word** söz əlavə etmək; **to ~ out** qovmaq, çıxartmaq, bayıra atmaq;
◊ **to ~ oneself forward** özünə fikir vermək; **to ~ oneself into *smb.'s* society** bir kəsin boğazına keçmək
**thud**[1] [θʌd] *n* **1.** taqqıltı, şappıltı; **the ~ of hooves** ayaq dırnaqlarının taqqıltısı (*atın*); **to fall with a ~** gumbultu ilə yerə yıxılmaq / düşmək; **2.** boğuq səs
**thud**[2] [θʌd] *v* (**-dd-**) **1.** yıxılmaq, düşmək, gumbultu ilə yıxılmaq; **2.** boğuq səslə dəymək, toxunmaq; *Bullets thudded into the sandbags Güllələr boğuq səslə qum kisələrinə dəydi*
**thug** [θʌg] *n* **1.** quldur, qatil; **2.** *amer.* evyaran oğru; talançı
**thuggee** [ˈθʌgi:] *n* = **thuggery**
**thuggery** [ˈθʌgərı] *n amer.* **1.** banditizm, quldurluq; **2.** qətl, öldürmə
**thumb**[1] [θʌm] *n* baş barmaq (*əldə*);
◊ **under *smb.'s* ~** bir kəsin tam təsiri / hökmü altında; *Thumbs up! Pis deyil! Yarayar!* **to be all ~s** ləng / bacarıqsız olmaq; **to be ~s down** əksinə / əleyhinə olmaq
**thumb**[2] [θʌm] *v* **1.** vərəqləmək, gözdən keçirmək; **to ~ through a book** kitab vərəqləmək; **2.** çirkləndirmək, ləkələndirmək; **3.** *d.d.* baş barmağı qaldırmaqla avtomobili saxlatmaq;
◊ **to ~ *one's* nose at *smb.*** sataşmaq, ağzını yamsılamaq
**thumb-index** [ˈθʌm,ındeks] *n* göstərici (*əlifba sırası ilə*)
**thumb-mark** [ˈθʌmma:k] *n* barmaq izi (*kitabın səhifələrində*)
**thumb-nail**[1] [ˈθʌmneıl] *n* baş barmağın dırnağı
**thumb-nail**[2] [ˈθʌmneıl] *adj* **1.** kiçik, balaca; **2.** qısa, müxtəsər; **~ sketch** qısa təsvir
**thumb-print** [ˈθʌmprınt] *n* baş barmağın izi
**thumb-tack** [ˈθʌmtæk] *n amer.* cizgi knopkası; basmadüymə
**thump**[1] [θʌmp] *n* **1.** tappıltı; ağır zərbə; *The baby fell out with a thump Uşaq tappıltı ilə yıxıldı;* **2.** boğuq səs
**thump**[2] [θʌmp] *v* **1.** döyəcləmək, ağır zərbə endirmək; **2.** vurulmaq, zərbə almaq; **3.** döyünmək; *His heart was thumping with excitement Həyəcandan onun ürəyi döyünürdü*
**thumper** [ˈθʌmpəʳ] *n* **1.** *d.d.* çox böyük bir şey; **2.** ağ / açıq-aşkar yalan
**thumping** [ˈθʌmpıŋ] *adj* çox iri / böyük, nəhəng; artıq, üstün; **~ majority** böyük əksəriyyət





**thunder**[1] [ˈθʌndəʳ] *n* **1.** ildırım, göy gurultusu; **2.** şaqqıltı, gurultu; **3.** *pl* kəskin məzəmmət
**thunder**[2] [ˈθʌndəʳ] *v* **1.** göy guruldamaq; guruldamaq; *Lorries thundered past Yük maşınları gurultu ilə keçib gedirdilər;* **2.** vurmaq; döyəcləmək; cingildəmək; *His voice thundered in my ears Onun səsi qulaqlarımda cingildədi;* **3.** dağıtmaq, darmadağın etmək; **4.** ucadan danışmaq, bərkdən demək
**thunderbolt** [ˈθʌndəboult] *n* ildırım vurması (*həm də məc.*); **to come / to be a ~** ildırım kimi çaxmaq / vurmaq; **like a ~ from / out of a clear sky** əsla gözlənilmədən; *This news was a thunderbolt to her Bu xəbər gözlənilmədən onun başına ildırım kimi çaxdı*
**thunderclap** [ˈθʌndəklæp] *n* **1.** ildırım çaxması; **2.** *məc.* gözlənilməz hadisə; müdhiş xəbər; *This news came on him like a thunderclap Bu xəbər onun üçün çox gözlənilməz oldu*
**thundercloud** [ˈθʌndəklaud] *n* qara bulud
**thunderer** [ˈθʌndərəʳ] *n* **1.** məğlubedilməz / yenilməz əsgər / döyüşçü; **2.** gözəl natiq
**thunderous** [ˈθʌndərəs] *adj* **1.** ildırımlı; **2.** gurultulu, çox güclü; **~ applause** gurultulu alqış
**thunderstorm** [ˈθʌndəstɔ:m] *n* tufan
**thunderstroke** [ˈθʌndəstrouk] *n* göy gurultusu, ildırım
**thunderstruck** [ˈθʌndəstrʌk] *adj* sarsımış, sarsıdılmış, çaşmış, çaşdırılmış; **~ with his misfortune** uğursuzluğundan sarsımış; **~ by / with the news** xəbərdən sarsımış / çaşmış
**Thursday** [ˈθə:zdı] *n* cümə axşamı; **on ~** cümə axşamı (günü)
**thus** [ðʌs] *adv* **1.** belə; beləliklə, bu minvalla; **~ and ~** belə və belə; bu cür; *He began thus O belə başladı;* **2.** …qədər, …kimi, -dək, -cən, -can; bu dərəcəyə qədər; **~ far** hələlik, bu vaxtacan, bu günəcən
**thwack**[1] [θwæk] *n* güclü zərbə (*xüs. qamçı və ya ağac zərbəsi*); **to give *smb.* a ~** bir kəsi qamçı ilə döymək
**thwack**[2] [θwæk] *v* **1.** zərbə ilə vurmaq, kötəkləmək, əzişdirmək; **to ~ *smb.*** bir kəsi kötəkləmək / əzişdirmək; **2.** beyninə yeritmək, başa salmaq; **3.** birləşdirmək; **4.** guppultu ilə düşmək; **to ~ down** guppultu ilə yerə düşmək
**thwart**[1] [θwɔ:t] *adj* **1.** köndələn, eninə / köndələn qoyulan; **~ lines** köndələn (*kəsişən*) xətlər; **~ wind** qarşıdan əsən külək; **2.** tərs, höcət
**thwart**[2] [θwɔ:t] *v* **1.** mane olmaq; **to ~ *smb.'s* plans** bir kəsin planlarına mane olmaq; **2.** pozmaq, dağıtmaq (*planı, məqsədi və s.*); **3.** etiraz etmək
**thyme** [taım] *n bot.* kəklikotu, kəkotu
**thyroid**[1] [ˈθaırɔıd] *n anat.* qalxanvarı vəzi
**thyroid**[2] [ˈθaırɔıd] *adj* qalxanabənzər, qalxanvarı; **~ gland** qalxanvarı vəzi
**Tibetan**[1] [tıˈbetən] *n* Tibetli, Tibet sakini
**Tibetan**[2] [tıˈbetən] *adj* Tibet; **~ writing** Tibet yazısı; **~ wool** Tibet yunu; **~ shawls** Tibet şalları
**tick**[1] [tık] *n* I *zool.* gənə
**tick** [tık] *n* II **1.** çıqqıltı, taqqıltı; **the ~ of the clock** saatın tıqqıltısı; **2.** işarə, nişan; **3.** *d.d.* dəqiqə, bircə dəqiqə; *Just a tick! Bircə dəqiqə!*
**tick** [tık] *n* III *d.d.* **1.** kredit; **to go ~** kredit götürmək; **to buy *smth.* on ~** bir şeyi kreditlə almaq; **to run on ~** kredit almaq; **2.** hesab, haqq-hesab
**tick** [tık] *n* IV örtük, çexol
**tick**[2] [tık] *v* I **1.** tıqqıldamaq, çıqqıldamaq (*saat*); **2.** nişan qoymaq, işarə etmək; **to ~ off** qeyd etmək, nişanlamaq; **to ~ the correct answer off a list** düzgün cavabları siyahıda qeyd etmək
**tick** [tık] *v* II **1.** kredit götürmək; **2.** kreditə vermək; **3.** *amer.* sadalamaq, bir-bir saymaq; *Tick off the names on the list Siyahıdakı adları oxu / oxuyun*
**ticker** [ˈtıkəʳ] *n* **1.** kəfkir, rəqqas (*saatda*); **2.** *d.d.* saat; **3.** *zaraf.* ürək, qəlb; **4.** *rad.* zummer
**ticker-tape** [ˈtıkəteıp] *n* teleqraf lenti
**ticket**[1] [ˈtıkıt] *n* **1.** bilet; **railroad / tram / theatre / concert ~** dəmiryol / tramvay / teatr / konsert bileti; **one-way ~** *amer.* birtərəfli bilet; **to take a ~ for the opera** operaya bilet almaq; **to order / to reserve a ~** bilet sifariş etmək; **2.** yarlıq; **price**

~ qiymət yarlığı; **3.** qəbz, nömrə; **cloak-room** ~ paltarasan nömrəsi; **4.** vəsiqə, bilet; **member's** ~ üzvlük bileti; **5.** *d.d. hərb.* ordudan tərxis olunma haqqında şəhadətnamə; **6.** elan (*kirayəyə / icarəyə vermək haq.*); **7.** *amer. d.d.* küçə hərəkətini pozmaq üstündə məhkəməyə çağırış vərəqəsi; **8.** *amer.* seçkidə seçicilərin siyahısı; **general** ~ ümumi siyahı; **to vote a** ~ siyahıya səs vermək; **9.** order; tələbnamə, sifariş; **10.** plan; **to write *one's* own** ~ həyatını planlaşdırmaq, gələcəyi üçün plan cızmaq

**ticket[2]** [ˈtɪkɪt] *adj* bilet; **a ~ collector** bilet yoxlayıcısı / nəzarətçisi

**ticket[3]** [ˈtɪkɪt] *v* **1.** yarlıq yapışdırmaq / vurmaq; **2.** *amer.* biletlə təmin / təchiz etmək; *The booking-office tickets from ten Bilet kassası saat ondan işləyir / bilet satır*

**tickle[1]** [ˈtɪkl] *n* qıdıq, qıdıqlama; **to give *smb.* a** ~ bir kəsi qıdıqlamaq

**tickle[2]** [ˈtɪkl] *v* **1.** qıdıqlamaq; **to ~ *smb.*** bir kəsi qıdıqlamaq; **2.** ayışmaq, gicişmək; *My nose tickles Mənim burnum gicişir;* **3.** zövq vermək; **4.** sevinmək; **to be ~d to death** şadlığından yerə-göyə sığmamaq; **to ~ to death** çox güldürmək, gülməkdən öldürmək; **5.** əl ilə tutmaq (*balığı*)

**tickler** [ˈtɪkləʳ] *n* **1.** çətinlik; **2.** çətin məsələ

**ticklish** [ˈtɪklɪʃ] *adj d.d.* **1.** güləyən; qıdığı gələn; **2.** küsəyən, dəymədüşər; **3.** çətin, müşkül; **a ~ question** çətin / müşkül məsələ

**tick-tack** [ˈtɪkˈtæk] *n* **1.** çıqqıltı, taqqıltı; çıqqıldama, taqqıldama; **2.** ürək döyüntüsü / səsi

**tidal** [taɪdl] *adj* qabarma; **~ wave** qabarma dalğası, ləpə; **~ basin** qabarma hövzəsi

**tidbit** [ˈtɪdbɪt] *n* dadlı / yağlı tikə

**tiddler** [ˈtɪdləʳ] *n d.d.* balaca balıq, balıqcıq

**tiddly** [ˈtɪdlɪ] *adj* kiçicik, bambalaca

**tide[1]** [taɪd] *n* **1.** qabarma və çəkilmə (*dəniz suyu haq.*); **high** ~ qabarma; **low** ~ çəkilmə; *The tide is coming in Qabarma başlayır;* **2.** sel, axın; istiqamət; **3.** hadisə, əhvalat; hadisələrin gedişi; *The tide has turned Hadisələr başqa səmtə yönəlib;* **to go with the** ~ *məc.* axınla getmək; **to turn the** ~ hadisələrin gedişini dəyişmək; **to go against the** ~ axının əksinə getmək, axına qarşı getmək; **4.** *məc.* kütlə, izdiham, dalğa; **the ~ of public discontent** xalqın narazılıq dalğası; **5.** *d.d.* vaxt, müddət; **double** ~ çox gərgin; qəzəblə, hiddətlə; **to work double ~s** gecə-gündüz çalışmaq

**tide[2]** [taɪd] *v* (**to ~ over**) **1.** öhdəsindən gəlmək, aradan qaldırmaq (*mənəvi*); **to ~ over a difficulty** çətinliyi aradan qaldırmaq; **2.** çatmaq, kifayət etmək; *Will ten dollars tide you over till Saturday? Şənbə gününə qədər sənə / sizə on dollar bəs edərmi?*

**tide-waiter** [ˈtaɪd,weɪtəʳ] *n* liman gömrükxanası məmuru

**tidewater** [ˈtaɪd,wɔ:təʳ] *n* qabarma suyu

**tideness** [ˈtaɪdnɪs] *n* səliqə, səliqəlilik, təmizkarlıq

**tidings** [ˈtaɪdɪŋz] *n pl* xəbərlər, yeniliklər; xəbər, yenilik; **good** ~ yaxşı xəbər; **evil** ~ pis / bəd xəbər; **to bring** ~ xəbər gətirmək; **to receive** ~ xəbər almaq

**tidy[1]** [ˈtaɪdɪ] *adj* **1.** səliqəli, təmizkar, təmiz; **a ~ room** səliqəli otaq; **a ~ person** təmizkar adam; **2.** *d.d.* xeyli, böyük; **a ~ sum** böyük məbləğ

**tidy[2]** [ˈtaɪdɪ] *v* səliqəyə / sahmana salmaq, yığışdırmaq, təmizləmək; **to ~ a room** otağı yığışdırmaq; **to ~ the papers on the desk** stolun üstündəki kağızları sahmana salmaq; **to ~ *one's* hair** saçını səliqəyə salmaq

**tie[1]** [taɪ] *n* **1.** rabitə; qovuşuq, düyün; **2.** *pl* buxov; tel, əlaqə; **the ~s of friendship** dostluq telləri; **trade ~s** ticarət əlaqələri; **blood ~s** qan əlaqələri / qohumluğu; **3.** qalstuk; **to wear a ~** qalstuk taxmaq; **4.** borc, öhdəlik; **the ~ of patriotism** vətənpərvərlik borcu; **a man free from bonds and ~s** heç bir öhdəliyi olmayan adam; **5.** əzab, əziyyət; **6.** *id.* heç-heçə oyun; **to end in a ~** heç-heçə qurtarmaq

**tie[2]** [taɪ] *v* **1.** bağlamaq; düyünləmək; qaytanlamaq; **to ~ *one's* shoes** ayaqqabıların ipini bağlamaq; *The prisoner's hands were tied together Dustağın əlləri bağlı idi;* **2.** sarımaq, sarğı bağlamaq; **3.** bitişdirmək; möhkəmlətmək; **4.** əlaqələndirmək; **5.** məcbur etmək; öhdəsinə qoymaq;





**6.** şərtləndirmək; **7.** *id.* hesabı bərabərləşdirmək; heç-heçə oynamaq; **to ~ the score** hesabı bərabərləşdirmək; **to ~ in** birləşdirmək, qoşmaq; **to ~ up** əlaqələndirmək; bağlamaq; *I don't tie it up Bu mənim yadıma heç nə salmır;* **8.** sərbəst fəaliyyəti məhdudlaşdırmaq; mane olmaq; **to be ~d up** *d.d.* **1)** ərə getmək, evlənmək; **2)** *məc.* başı bağlı olmaq; **9.** uyğun gəlmək / olmaq, düz / tən gəlmək; **10.** (**with**) səyləri birləşdirmək; sıx birləşmək

**tier** [taɪəʳ] *n* **1.** bağlayan, sarıyan (*adam*); **2.** bərkitmə, bağlama; **3.** sıra, cərgə; **4.** *amer.* uşaq önlüyü / döşlüyü

**tierce** [tɪəs] *n* **1.** boçka, çəllək; **2.** *id.* üçüncü mövqe və müdafiə

**tiff** [tɪf] *n* inciklik, küsmə; **small ~** kiçicik inciklik / küsüşmə

**tiffany** [ˈtɪfənɪ] *n toxuc.* nazik / qaz-qaz ipək parça, şəffaf ipək örtük

**tig[1]** [tɪg] *n* **1.** toxunma, əl vurma; **2.** qaçdı-tutdu (*uşaq oyunu*); **to play (at) ~** qaçdı-tutdu oynamaq; **3.** dalaşma, dava; **to be in a ~** küsüşmək, arası dəymək

**tig[2]** [tɪg] *v* **1.** yağlamaq, yağ çəkmək; **2.** toxunmaq, təmas etmək

**tiger[1]** [ˈtaɪgəʳ] *n* **1.** *zool.* pələng; **red ~** kuquar, puma; **2.** qorxulu rəqib (*idman oyunlarında*); **3.** davakar, dalaşqan

**tiger[2]** [ˈtaɪgəʳ] *adj* pələng; **~ skin** pələng dərisi

**tigerish** [ˈtaɪgərɪʃ] *adj* **1.** pələng, pələng kimi; **~ stripes** pələng kimi zolaqlı; **2.** yırtıcı, qəddar, hiddətli; **3.** pələng çox olan yer; **the ~ section of the jungle** pələng çox olan cəngəllik bölməsi

**tight[1]** [taɪt] *adj* **1.** sıx; bərk; yumulmuş; **~ quarters** sıx otaq, dar yer; **2.** sukeçirməyən; havakeçirməyən; **a ~ boat** sukeçirməyən qayıq; **3.** dar, ensiz; **a ~ shirt** dar köynək; *This jacket is tight across the shoulders Bu jaket çiyinlərdən dardır;* **4.** bərk, tarım; gərgin, tarım çəkilmiş; **a ~ knot** bərk düyün; **~ nerves** gərgin əsəb; **~ spring** tarıma çəkilmiş yay; **5.** çətin, ağır; **to be in a ~ place / corner** çətin vəziyyətdə olmaq; *The money is tight these days Bu günlərdə pul məsələsi bir qədər çətindir;* **6.** *d.d.* xəsis, simic, bərk; **7.** yığcam (*üslub və s. haq.*); **8.** *d.d.* sərxoş, kefli; **~ as a drum** tamamilə sərxoş; **9.** ciddi, tələbkar; **~ control** ciddi nəzarət; **to keep a ~ hold on *smb.*** bir kəsdən bərk tutmaq / yapışmaq;

◊ **to keep *one's* mouth ~ shut** dilini sakit saxlamaq, susmaq; **to get *smb.* in a ~ corner** bir kəsi divara dirəmək / küncə sıxmaq; bir kəsi ağır vəziyyətə salmaq

**tight[2]** [taɪt] *adv* **1.** sıx, kip; **2.** bərk, tarım; möhkəm; **to sit ~** bərk durmaq, mövqeyini əldən verməmək; **to tie the knot ~** bərk düyünləmək; *Hold tight! Möhkəm tut / tutun!* **3.** rahat, bərk; **to sleep ~** bərk yatmaq

**tighten** [ˈtaɪtn] *v* **1.** sıxılmaq, sıxmaq; sıxlaşdırmaq, bərkitmək; **to ~ *one's* belt** kəmərini bərkitmək; **2.** yumulmaq, yummaq; **3.** dartmaq, gərmək; **to ~ the brakes** əyləci dartıb nizamlamaq; **to ~ the strings of a violin** skripkanın simlərini dartıb kökləmək; **4.** *məc.* gücləndirmək, kəskinləşdirmək, sərtləşdirmək; **to ~ control** nəzarəti gücləndirmək; **to ~ the rules** qaydaları sərtləşdirmək; **to ~ upon discipline** nizam-intizamı gücləndirmək; **to ~ restrictions** məhdudiyyətləri kəskinləşdirmək

**tight-fisted** [ˈtaɪtˈfɪstɪd] *adj* xəsis, simic, bərk

**tight-lipped** [ˈtaɪtˈlɪpt] *adj* dinməz, danışmaz

**tightness** [ˈtaɪtnɪs] *n* **1.** gərginlik; **~ in the air** gərgin mühit, gərginlik şəraiti; **2.** *amer.* darısqallıq; sıxma, sıxılma; *I feel a tightness in my chest Sinəm / Ürəyim sıxılır*

**tightrope** [ˈtaɪtroup] *n* tarım çəkilmiş kanat / buraz

**tightrope-dancer** [ˈtaɪtroup,dɑ:nsəʳ] *n* kəndirbaz

**tights** [taɪts] *n pl* **1.** triko, trikotaj idman paltarı; **2.** reytuz

**tightwad** [ˈtaɪtwɔd] *n d.d.* çox xəsis / simic adam

**tigress** [ˈtaɪgrɪs] *n* dişi pələng

**til** [tɪl] *n bot.* küncüt

**tilde** [tɪld] *n poliqr.* tilda

**tile[1]** [taɪl] *n* **1.** kirəmit, sifal; **2.** kaşı; **3.** plitka; **4.** *d.d.* şlyapa, silindr

